***Ömər əbu Mücahid***

# *NAMAZ DİNİN DİRƏYİDİR!*

**(*Namazı İslam əlaməti görməyənlərə bir nəsihətdir.* )**

Muhərrəm ,1434.

بسم الله الرحمن الرحيم

Aləmlərin Rəbbi olan Allaha sonsuz həmd və şükrlər olsun.
O Allah ki, göyləri və yeri altı gündə yaratdı və Öz əzəmtli Ərşinə isteva etdi. Onun Elmi və Qüdrəti hər şeyi əhatə etmişdir. O insanları zülmətlərdən nura çıxarmaq üçün, aləmlərə rəhmət olaraq Muhəmmədi (sallallahu aleyhi və səlləm ) Haqq dinlə və hidayətlə göndərdi. Qullarının hesabı yalnız Ona aiddir. Ürəkləri dəhşətə salacaq Qiyamət günündə hər bir kəsin əməlinin qarşılığını əksiltmədən verən Allahu Təala ibadət və itaət olunmağa ən layiq olandır. Biz Ona həmd edir, Ondan yardım diləyir və xatalarımızın, günahlarımızın bağışlanmasını da yalnız Ondan istəyirik. Ey Rəbbimiz olan

Allahu Təala! Bizə rəhm et. Biz Sənin qullarınıq və axır dönüşümüz də yalnız Sənədir.

Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə və itaətə layiq olan haqq məbud yoxdur. O təkdir və mülkündə, işləri idarə etməsində və hökmündə Onun heç bir şəriki yoxdur.

Şəhadət edirəm ki, iman edənlərin, saleh əməllərlərlə qulluq edənlərin, səbr edənlərin və elmləri ilə, malları ilə, canları ilə Allah yolunda cihad edənlərin ən gözəl örnəyi və rəhbəri olan Muhəmməd (sallallahu aleyhi və səlləm) Allahu Təalanın qulu və son rəsulu və nəbisidir.

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahu Təalanın Kəlamı olan Qurani-Kərim, yolların ən xeyirlisi isə Muhəmmədin (sallallahu aleyhi və səlləm) yoludur. İşlərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə gətirilən hər

əməl bidət, hər bir bidət zəlalət və hər bir zəlalət isə atəşdədir.

Bu kiçik risaləni yazarkən öz nəfsimdən və şeytanın sapdırmasından Uca və Əzəmətli Allahu Təalaya sığınıram. O kimə hidayət vermişsə o kəsi azdıracaq heç kimsə yoxdur. Kimi zəlalətə salmışsa, ona hidayət verəcək bir kimsə yoxdur. Bu Allahın dəyişməz sünnətidir. "***Sən Allahın sünnətində heç bir dəyişiklik görə bilməzsən.***" (əl-Əhzab, 62).

Yaşadığımız günlərdə İslam torpaqlarında baş verən hadisələr və bəzi qardaşlarımızın müsəlmanların diqqətini, istər biləræk və istərsə də bilməyərək bu hadisələrin baş vermə səbəblərindən və Allah yolunda aparılan müqəddəs cihaddan yayındırmağa çalışması məni bu sözləri yazmağa vadar etdi. Məsələ çox vahim və müsəlmanların birliyini pozmaq açısından üzərində şiddətlə durulması lazım olan mühüm bir məsələdir. Mövzumuz "Na-

mazın zahiri İslam əlaməti olub olmamasıdır ”. Mövzu ilə əlaqədar olaraq dəyərli qardaşım Murat Gezenlerin “ İslam əlamətləri və Namaz “ adlı kiçik risaləsini və İslam dəvəti yolunda böyük işlər görmüş dəyərli elm adamı Əbu Hənzələnin səsli dərsini araşdırdım. İlk öncə bu araşdırmalarına görə hər iki qardaşıma Allahu Təaladan savablarını bol etməsini diləyirəm. Əgər haqqa isabət etmişlərsə, iki savab, xata etmişlərsə, bir savab qazanmış oldular. Bu  Sələfi-salihinin izlədiyi ən doğru yoldur. Lakin bizim nəsihətimiz bu mövzunu doğru anlamayıb, müsəlmanların içində təfriqə salmağa çalışanlaradır.

Bu risalədə izləyəcəyim metod sələfin Quran və səhih sünnətin mövcud olduğu yerdə əsla vaqeələri dəlil almayacağı və vaqeələri də yalnız nassın işığında dəyərləndirəcəyi metodudur. Çünki bizim ağıllarımız şəri hökmləri saf-çürük etməyə, onlardan istədiyimiz nəticələr çıxar-

maq üçün yetərli deyil. Əksinə bizə düşən şəriətin hökmlərinə elə Allahu Təalanın və Onun Rasulunun qoyduğu ölçülərlə bağlanmaqdır. Uca Allahdan bu işdə mənə yardım etməsini və yalnız haqqa isabət etdirməsini istəyirəm.

## *1.<u>Müxaliflərin gətirdiyi dəlillər.</u>*

İlk öncə Namazın bizim yaşadığımız məkan və zaman üçün bir əlamət olmadığını və bunun həm müsəlmanların, həm də müşriklərin ortaq əməli olaraq, əsla haqqlarında müsəlman hökmünü verə bilməmiz üçün yetərli olmadığını deyənlərin dəlil olaraq zənn etdiyi bir neçə məsələni qeyd edək.

1)Bu gün yaşadığımız bölgədə namaz həm müsəlmanların, həm də müşriklərin ortaq əməlinə dönmüşdür. Bu səbəblə bir kişinin müsəlman olması və onun haqqında

müsəlman hökmünü verə bilməyimiz üçün bu namaz yetərli deyildir. Çünki o zaman müsəlmanlara aid olan haqları bilmədən müşriklərə tanımış oluruq ki, bu da Allahu Təala üçün dostluq və düşmənlik etmək baxımından bir sıra xatalara yol aça bilər. Xüsusən də içində yaşadığımız bölgədə nə qədər namaz qılanlar vardır ki, onlar açıq olaraq küfür əməlləri etməkdə, tağutlara və onların dəstəkçilərinə yardım etməkdədirlər. Buna baxmayaraq, onlar namaz qılır, oruc tutur, həcc edir və müsəlmanlara xas olan digər əməlləri də edirlər. Əgər biz onlarla müsəlman muamiləsi etsək, o zaman imanın həqiqətlərinə etiqad edib etməməsinin bir önəmi qalmaz. Halbuki bir insanın müsəlman olması üçün əsil olan etiqadının səhih olması şərtidir. Bir müsəlmana vacib olan bu cür məsələlərdə ehtiyatlı olması, müamilə etdiyi zaman kişinin etiqadını bilib sonra ona uyğun olaraq müamilə etməsidir.

2) Buna dəvət edənlər belə deyirlər ki, biz yalnız mükəlləf olduğumuz halda insanların haqqında müsəlman və ya kafir olduqlarını araşdırarıq. Yoxsa ki, küçədə gedən birisinin kafir və ya müsəlman olması bizi maraqlandırmaz.
3) Darul-küfrdə yaşayan insanların əsli hökmlərinin kafir olduğu üçün biz halı qapalı olan insanlara ümumən kafir müaminləsi edərik.
4) Məscidlərdə, namaz otaqlarında və digər bu kimi yerlərdə namaz qılan insanlar kafirlərdən də, müsəlmanlardan da ola bildiyi üçün biz onun haqqında yaşadığı bölgənin hökmünə görə hökm veririk. Namaz İslamın usulundan deyil, furusundan olduğundan dolayı biz etiqadını bilmədən bu cür insanların namazını onların İslamları üçün şərt görmürük. Əsil olan "Lə İləhə İlləllah, Muhəmmədən Rasulullah" kəlməsinin etiqad olaraq bir insanda olması-

dır. Bu isə yalnız onun etiqadını araşdırmaqla bilinə bilən  məsələdir.
5) Yolda gedən bir insana, istər kişi, istərsə də qadın olsun, müsəlman haqqlarının ödənməsi üçün onların zahiri görkəmlərinin necə olması önəmli deyil. Hicablı, niqablı birisinə hətta kafirlər təcavüz etsələr belə, biz ona yardım etməklə mükəlləf deyilik. Çünki biz onun müsəlman və ya kafir olduğunu bilmirik. Sual etdiyimiz zaman ki, küçədə bir kişini maşın vurub öldürübsə, o adamın zahirində saqqal, isbal və bu kimi İslama xas olan əlamətlərdən biri olarsa, biz bu adamı hansı qaydada dəfn etməliyik—bizə cavab bu oldu ki, biz adamı müsəlmanlara uyğun şəkildə dəfn etmərik, o vaxta qədər ki, onun haqqında lazımi məlumat əldə edək. Əgər heç kimsə onu tanımırsa, biz onu bir quyu qazıb basdırarıq. Bu isə təbii ki, kafirlərə xas olan bir müamilədir.

## *2. Müşəbbihlərin gətirdiyi dəlillər.*

1)Bu barədə yazan Murat Gəzənlərdən sitatlar gətirməklə məsələnin ana xətlərini bildirmək daha düzgün olardı. Çünki digərləri bu məsələni elmi əsaslara deyil də, tamamilə zənn və ehtimallara bağlamışlar. Odur ki, ən doğru olanı dəlillərə baxmağımızdır. Yazar öz sözlərinə Buxarinin(r.a) " Səhih "də gətirdiyi bu hədislə qüvvət verir: " Kim bizim qıldığımız namazı qılar, bizim qibləmizə yönələr və bizim kəsdiyimizi yeyərsə, bu kimsə müsəlmandır."
Sitat: "Ancaq üzülərək bidirməkdə fayda vardır ki, bu hədislə istidlalda bulunan kimsələr açıq bir şəkildə hədisin zahirinə yapışmışlar, ləfzə tabe olaraq məfhumdan uzaqlaşmışlar. Bilindiyi kimi usulda əsil olan dəlil almada ləfzə deyil, məfhuma

baxmaqdır.Hər nə qədər məfhumun ortaya çıxmasında ləfzin ciddi bir önəmi varsa da, hökmdə əsil olan məfhumdur.”

Digər bir yerdə isə yazır: “ Rasulullah (sallallahu aleyhi və səlləm) hədisdə əcəba nədən “kim namaz qılarsa” deməmiş, buna qarşılıq olaraq “bizim qıldığımız namazı qılarsa...”demişdir? Zira hədisdə “salətənə” ifadəsi işlədilərək müsəlmanlara izafə edilən bir namaz, kişinin İslamı üçün şərt gətirilmişdir?

-Hədisdə nə üçün namaz ibadəti zikr edilərkən, oruc, zəkat, həcc kimi ibadətlərdən biri zikr edilməmişdir?

-Nə üçün “bizim namazımızı” qılarsa şərtilə yetinməyib qibləmizə yönəlmək şərti də zikr edilmişdir. Və bu şərt “bizim qibləmizə” şəklində gətirilmişdir?

- Nə üçün namazın təharət, övrətin örtülməsi kimi digər şərtləri zikr edilməmiş, sadəcə qibləmizə yönəlmək şərti zikr edilmişdir?

-Bu iki şərtə binaən nəyə görə üçüncü şərt olaraq “ kəsdiyimizi yeyərsə” şərti gətirilmişdir. Kəsdiyimizi yeməsi ilə kişinin müsəlmanlığı arasında nə əlaqə vardır?”

Yenə də digər bir səhifədə məzhəb alimlərinin görüşlərini zikr etmişdir:

“Həm Hənbəlilər, həm də Hənəfilər namaz feli ilə kafirin Müsəlman olacağına hökm etmişlər. Ancaq Hənbəlilər qılınan namazın camaatla ya da fərdi olmasını, yenə də darul-hərbdə ya da darul-İslamda olması arasında fərq qoymamışlar. Nə zaman namaz qılarsa, İslamına hökm edilir demişlər. Malikilər və Şafilərdən bəziləri isə, sadəcə namaz ilə bir kafirin Müsəlmanlığına hökm edilməz. Çünki namaz İslamın furusundandır. Həcc etmək, oruc tutmaq kimi sadəcə namaz qılmaqla kişi müsəlman olmaz. Çünki Rasulullah (sallallahu aleyhi və səlləm ) “İnsanlarla Lə İləhə İlləllah deyincəyə qədər

savaşmaqla əmr olundum...” demişdir. Yenə Şafilərdən bəziləri “ şayəd darul-İslamda namaz qılarsa onun İslamına hökm edilməz. Çünki bu durumda dinini gizləyərək namaz qılması ehtimalı vardır.”

“Mövzu ilə əlaqədar Maliki məzhəbi alimlərinin görüşlərinə gəlincə, bu barədə Maliki məzhəbində fərqli görüşlər var. Necə ki, əş-Şərhul-Kəbirdə namaz qılan bir kimsə üçün “iki şəhadət kəlməsini söyləmədiyi müddətcə islamına hökm edilməz” deyilmişdir. Buna qarşılıq əş-Şərhul-Kəbirin haşiyəsi olan Haşiyətul-Dusikidə isə hər iki görüşdə,yəni namaz qılan bir kimsənin müsəlmanlığına hökm edilə biləcəyi kimi, müsəlmanlığına hökm edilməyəcəyi görüşləri də zikr edilmişdir.

“İbnul-Arabi deyir ki: “ Görüşümüzə görə belə bir kimsə bunları etməklə müsəlman olmaz. Şayəd ona:” bu namazın arxa planı nədir? ” soruşulacaq olarsa, o da : ” Mənim bu qıldığım namaz, müsəl-

man olaraq qıldığım namazdır” deyərsə, ona; ” Lə İləhə İlləllah” de deyilir. Bunu deyərsə, doğru dediyi ortaya çıxar. Əgər bunu deməzsə, onun bu davranışının bir oyun olduğunu öyrənmiş oluruq. Bununla birlikdə belə bir davranışla müsəlman olacağını qəbul edənlərin görüşünə görə mürtəd olur. Ancaq səhih olan görüşə görə bunun əsli bir küfr olduğudur.”

Başqa bir yerdə də deyir: “ Son olaraq mövzu haqqında vermiş olduğumuz bilgilər işığında deyirik ki;...

Öncəliklə İslam əlaməti daşıyan bir kimsəyə birbaşa olaraq müsəlman hökmü veriləcəyi görüşü üzərində nə ümmətin bir ittifaqı, nə də bir icması vardır. Məzhəb alimlərindən yalnız Hənbəli alimləri namazı açıq bir İslam əlaməti olaraq görmüşlər və nə şəkildə olursa olsun namaz qılan bir kimsəyə müsəlman hökmü veriləcəyini bildirmişlər. Ancaq Hənbəli alimləri bu fətvalarına təməl əsas olaraq

namaz əməlinin sadəcə İslam dinində olduğunu, kafir və müşriklərin namaz kimi bir əməli icra etmədiklərini almışlar.”.

“ Bu gün içində yaşadığımız bu toplumda bütün digər müşrik toplumlar kimi Allaha iman etdiyini iddia edən, bu iddialarının nəticəsində özlərini Rasulullaha nisbət edən və bir sıra əməlləri yerinə yetirən bir toplumdur. İçində yaşadığımız bu toplumun fərdlərinin Lə İləhə İlləllah demələri, özlərini müsəlman adlandırmaları , namaz qılıb dini ibadətləri yerinə yetirmələri İslam dininin xüsusiyyəti olmasından deyil, şirk dinlərinin bir gərəyidir.Və biz müşriklərin öz dinlərinin gərəyi olaraq etdikləri əməllərlə onları müsəlman adlandıra bilmərik.”

Əbu Hənzələ “ Darul-küfrdə təkfir” dərsində belə deyir:

“ Darul-küfrdə insanlar üç qisimdir. İslamını izhar edənlər, küfrünü izhar edənlər və nə islamını, nə də küfrünü iz-

har etməyənlər.Darul-İslamda əsil olan insanın müsəlman olduğudur, xilafını izhar etmədikcə insanlar müsəlman hökmündədirlər. Küfür yurdunda da əsil olan insanların kafir olduğudur, ta ki, xilafını izhar edincəyə qədər. Bunun xilafı İslamdır. Bunun dəlili fiqhin bu qaydasıdır: "Hökm həmişə qalib olana görə verilir, nadir olana görə deyil."

"Burada edilən ən böyük xatalardan biri də Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) zamanında İslam əlaməti kimi qəbul edilən bəzi əlamətləri bu gün olduğu kimi İslam əlaməti qəbul etməkdir. Lakin Məkkədə ikən şəriət fərqli bir şeyi İslam əlaməti kimi qəbul edir, Mədinədə isə fərqli bir şeyi əlamət olaraq qəbul edir. Misal üçün Həcc Məkkədə İslam əlaməti deyilkən, Tövbə surəsi 28-ci ayə ilə İslam əlaməti oldu. Demək ki,bu ayə ilə Həcc sadəcə və sadəcə İslama aid olub və müsəlmanları digər millətlərdən ayıran bir

əlamət oldu. Bir zaman İslam əlaməti olmayan  şey müəyyən vaxtdan sonra İslam əlaməti olursa, demək İslam əlaməti olan hansısa bir şey bu gün İslam əlaməti olmaya bilər. Bu gün ən böyük xata namazı və Lə İləhə İlləllahı İslam əlaməti saymaqdır. Çünki bu gün Lə İləhə İlləllah müsəlman və kafiri bir-birindən ayıran bir əlamət deyil. Küfrü sabit olan birisi bu gün bu kəlməni də deyir, namaz da qılır, həcc də edir. O zaman bunlar onun üçün necə əlamət ola bilər. Bu bölgədə insanlar üçün İslam əlaməti olan şey mövcud olan şirkdən təbərri etməsidir."

Biz bu sözləri daha da uzada bilərik. Lakin məsələ dəlillərə deyil də, vaqeələrin izahına dayandırıldığı üçün bunu uzatmaq fikrimiz yoxdur. İndi isə bu məsələyə Quran və Sünnət dəlilləri əsasında, eləcə də alimlərin yanaşması ilə aydınlıq gətirmək istəyirəm. Allahdan bu işdə yardım istəyirəm. Uğur Allahdandır.

## *Quran və Sunnətin müsəlman kimi tanıdığı insanın vəsfi.*

Aləmlərin Rəbbi olan Uca və Əzəmətli Allaha yaratdıqlarının sayı qədər həmd və şükrlər olsun. Məxluqatın ən şərəflisi, son Rasul və Nəbi olan Seyyidimiz Muhəmmədə, onun ailəsinə, əshabına və qiyamətə qədər onun yolu üzərində səbatla yürüyənlərə salat və salam olsun.

“ ***Ey Rəbbim, köksümü açıb genişlət! İşimi yüngülləşdir! Dilimdəki düyünü aç ki, sözümü anlasınlar”*** (Ta ha, 25-28)

Bu mövzu haqqında yazmağıma səbəb Azərbaycanda son vaxtlar ortaya atılmış “ İslam əlamətləri” məsələsidir. Artıq iş o yerə gəldi ki, bu haqda fərqli düşünənləri təkfir etməyə qalxan insanlar meydana

çıxdılar. Bəzilərinin cahilcəsinə danışıqlarını əsas alan bu muqallidlər bunun nə fəsadlar törətdiyinin fərqinə belə varmadan sağa-sola hər kəsi təkfir etdilər. Bu məsələdə elmi metodu izləyən çox az adam qaldı ki, bunun təkfir üçün səbəb olmadığını bilir. Lakin bəla burasındadır ki, bu adamların sözlərini düzgün başa düşməyənlər kor-koranə onları təqlid edirlər. Mənim nəsihətim ilk növbədə bu fikirdə olan elm tələbələrinə, sonra isə təkfirin qaydasını, şərtlərini bilməyib müsəlmanları təkfir edən cahil müsəlmanlaradır.

Bir şey haqqında elmsiz danışmaq insanı böyük günahlara gətirib çıxardığı üçün Quran və Sünnətdə yasaqlanmışdır. Bunun səbəbi elmsiz insanın həm özünə, həm başqalarına, həm də Allahu Təalaya qarşı bilmədən zülm edə biləcəyidir. Allahu Təala kafir və müşrikləri elmsizlikdə, anlamaz tayfa olduqlarında qınayır.

Bu isə o deməkdir ki, elmsiz danışmaq, başqalarının haqqında cahilcəsinə hökm vermək küfrdən bir şöbədir. Həm də bu haramlardan biridir. Allahu Təala buyurur:

***" De: " Rəbbim həm aşkar, həm də gizli edilən pislikləri, hər cür günahı, haqsızca zülm etməyi, Allahın, haqqında heç bir dəlil nazil etmədiyi bir şeyi Ona şərik qoşmağınızı və Allah haqqında bilmədiyiniz şeyləri söyləməyi haram etmişdir."***

(əl-Əraf, 33)

***" Ey insanlar! Yerdə olan halal və təmiz nemətlərdən yeyin, şeytanın addım izləri ilə getməyin! O sizin açıq-aşkar düşməninizdir.***

***O sizə pis və iyrənc işlər görməyi və Allaha qarşı bilmədiyiniz şeyləri söyləməyi əmr edər."***

(əl-Bəqərə,168-169)

***" ... Bəs nə üçün bilmədiyiniz məsələlər barədə mübahisə edirsiniz?"***

(Ali-İmran,66)

*“ Əgər bilmirsinizsə, zikr əhlindən soruşun.”*

( ən-Nəhl, 43)

Bu zikr etdiyimiz ayələrdən anlaşılan budur ki, bir işin həqiqətini bilməyən birisinin bu haqda danışması haram və şeytanın tələsinə düşməkdir. Əgər bu məsələ din mövzusudursa, bu daha ağırdır. Bir hədis bunu çox gözəl açıqlayır:

“ İbn Abbas (r.a) rəvayət edir ki, döyüşlərin birində bir kişi yaralandı. Sonra o kişi cünub oldu. Səhabələrdən bəziləri ona qüsl etməyi bildirdilər. Adam qüsl etdi və öldü. Rasulullah (sallallahu aleyhi və səlləm) bunu eşidincə belə dedi: “ Onu öldürdülər. Allah da onları öldürsün. Məgər bilmirdilərsə, soruşmalı deyildilərmi? Çünki cəhalətin şəfası soruşmaqdır. Ona təyəmmüm etmək lazım idi.”

(Əbu Davud, İbn Macə)

Bu hədisdə açıq görünən budur ki, Allah Rasulu (sallallahu aleyhi və səlləm) dini mövzular içərisində ən sadə olan təyəmmüm haqqında elmsiz fətva verənlərə bəd dua edir.

İndi baxın, İslami elmlərdə kamil elmə sahib olan qazilərin belə hökm verməkdə çətinlik çəkdiyi mövzularda, təəssüflər olsun ki, bu gün elmdən nəsibi olmayanlar çox asanlıqla hökm verirlər. Bureydə (r.a) rəvayət edir ki, Rasulullah (sallallahu aleyhi və səlləm) dedi: " Qazilər üç qisimdir. Bunlardan biri cənnətdə, ikisi isə cəhənnəmdədir. Cənnətdə olan, haqqı bilib, doğru fətva verəndir. Cəhənnəmdə olanlar isə zülmlə hökm verən və insanlar arasında cahilcəsinə hökm verəndir."

( Əbu Davud)

İbni Qeyyim (r.h) deyir ki, " Fətva verməyə əhil olmadan birinin fətva verməsi asilik və günahdır. Əgər əmir onu bu halda görüb çəkindirmirsə, o da asi və günahkar

olur. İmam Şafii, İmam Əhməd və başqa imamlar qəti bir şəkildə deyirlər ki, kişiyə elmsiz bir şəkildə fətva verməsi halal deyildir.” (İlamul-muvakkiin)

Abdullah bin Amr bin əl- As (r.a) Allah Rasulundan (sallallahu aleyhi və səlləm) rəvayət edir: “ Allah elmi qullarından bir anda almaz, əvvəlcə alimləri yer üzərindən götürər. Sonunda bir alim belə qalmaz. Xalq da bir sıra cahilləri əmir seçər, onlar da verilən suallara elmsizcə fətva verub, həm özlərini, həm də başqalarını azdırarlar.” (Buxari)

Bu ayə hədislər sadəcə bir xatırlatma idi. Çünki zamanımızda bir çoxları təkfirin qaydalarını, şərtlərini və əngəllərini bilmədən cahilcəsinə müsəlmanları təkfir edirlər. Biriləri elə zənn edir ki, çox təkfir etmək imanın gücünü göstərir. Əsla belə deyildir. Təkfir etmək ilk növbədə şəri bir hökmdür. Bunu edən şəxsin buna əhil olması və verdiyi hökmü Allah və Rasulu-

nun hökmü olaraq verməsi lazımdır. Yoxsa ki, ehtimalla, zənnlə, hava və həvəslə bunun edilməsi haramdır.

Bildiyimiz kimi təkfirin bəlli şərtləri və qaydaları vardır. Bu haqda böyük İslam alimlərinin dediklərinə baxaq. İbn Teymiyyə (r.a) belə deyir:

"***Dəlil mövcud olub, yol apaçıq oluncaya qədər xata edən bir müsəlmanı kimsənin təkfir etməyə haqqı yoxdur. Müsəlmanlığı yəqin olan bir kimsənin İslamı şübhə ilə ortadan qalxmaz. Çünki dəlil yəqin olub şübhə ortadan qalxmadıqca Müsəlman kişinin müsəlmanlığı ortadan qalxmaz.***

(İbni Teymiyyə, Məcmuul-Fətava, 12/250)

Digər bir yerdə deyir :

***" Quran, Sünnət və icmaya görə küfr olan söz üçün ümumi olaraq küfr olduğu deyilir. Şəri dəlillər buna dəlalət edir. Allah və Rasulundan alınan hökmlər,***

***insanların zənn və həvəsinə görə istifadə edilən hökmlər deyildir. Ancaq təkfirin şərtləri sabit oluncaya və əngəllər orta-dan qalxıncaya qədər bu sözü söyləyən hər kəs üçün kafir olduğunu söyləmək gərəkməz.”***

(İbni Teymiyyə, Məcmuul-Fətava, 35/101).

İmam Şövkani(r.a) “əs-Seylul-Carrar” adlı kitabında belə deyir:

***“Bir insanın İslamdan çıxdığını və küfrə girdiyini söyləmək, günəşin aydınlığın-dan daha açıq bir dəlil olmadan Allaha və Axirət gününə inanan bir müsəlma-nın edəcəyi bir iş deyildir. Çünki səhabədən bir qrup yolu ilə rəvayət edilən hədislərdə “Kim Müsəlman qardaşına kafir deyərsə, ikisindən biri kafir olmuşdur” buyurulmuşdur. Bu hədislərdə, təkfir məsələsində ən böyük əngəl və ən böyük çəkindirmə vardır.”***

***Yenə deyir:***

***“ Dininə önəm verən bir insan, şübhəli də olsa, çəkindirilmiş bir işi etməz və özünə izn verilmədiyi halda, vermiş olduğu bir addan dolayı xata etdiyi təqdirdə, Rasulullahın (sallallahu aleyhi və səlləm) “kafir” olaraq bəyan etdiyi kişilər arasında olmaqdan necə qorxmaya bilər. Bunu şəriət qəbul etmədiyi kimi, ağıl da qəbul etməz.”***

(İmam Şövkani, əs-Seylul-Carrar, 4/578-579)

Bu haqda dövrümüzün elm əhlindən bir çox alimlər də gözəl sözlər demişlər. Allahu Təala onları hifz etsin. Fəzilətli şeyx Əbu Asim əl-Məqdisi deyir:

***“Təkfirin şərtləri üç qismə ayrılır:***

***Birinci qisim: Təkfir edilən, yəni fail ilə bağlı şərtlər. Bunlar failin ağıllı və həddbuluğa çatan, felini qəsdli və bilərək işləməsi və sərbəst iradəsi ilə bunu seçmiş olmasıdır. Bu qisim, buradakı şərtlərin ziddi olan əngəllər ilə bağlı irəlidə bildi-***

***rilәcәk. Çünki әngәllәr, şәrtlәrin ziddi olan şeylәrdir.***

***İkinci qisim: Tәkfir hökmünün sәbәbi vә illәti olan fel ilә bağlı şәrtlәrdir. Bu felin şübhәsiz ki, küfrә düşürücü olması gәrәkdir. Bu isә mükәllәfin felinin dәlalәt etdiyi şeyin açıq olması vә şәri dәlilin o әmәlin küfr olmasına dәlalәt etmәsinin qәti olması ilә olur. İrәlidә bu qisim üzәrindә duracağıq.***

***Üçüncü qisim: Mükәllәfin felinin isbatlanmasında axtarılan şәrtlәrdir. Bunun zәnn ilә, tәxmin ilә, şübhә vә ehtimal ilә deyil, şәri sәhih vә sarih bir yol ilә sabit olması gәrәkdir. Bu isә kişinin işlәdiyi feli qәbul etmәsi vә ya әdalәt sahibi olan iki kişinin şahidliyi ilә olur.”***

(Mәqdisi, Otuz risalә, 56)

Yenә hәmin kitabda şeyx Mәqdisi tәkfirin әngәllәri ilә baglı deyir:

***“Fel ilә bağlı әngәllәr.***

***Bu iki qisimdir:***

***Birincisi: Söylənən sözün və ya əməlin küfrə dəlalət etmədə açıq olmaması.***
***İkincisi: Söylənən bu sözün və ya bu əməlin küfr olduğuna dair göstərilən dəlilin, bu fel və ya söz üçün qəti dəlil olmaması.***

(Məqdisi, Otuz Risalə, 73)

Bu sözləri yazmağıma səbəb, təkfirin qaydalarını bilməyən cahil müsəlmanlara bir xatırlatma etmək idi. Cünki namazı İslam əlaməti saymayanlar, təkfirin şərtlərinə və əngəllərinə baxmaq bir yana qalsın, ehtimal belə olmadığı yerdə kişinin namaz qılmasını onun İslamına deyil də, küfrünə əlamət sayaraq bunun üçün bir sıra səbəblər qoyurlar. Halbuki bu səbəblərin heç birisi təkfir üçün yetərli deyildir. Səbəblər dedikdə, sünnətə uyğun namaz qılan birisinin tağutları dəstəkləyən və ya murciyə əqidəli biri olma ehtimalı olduğu üçün ən azından bu kişi haqqında ehtiyat etməkdir. Və işin qəribəsi budur ki, bu

ehtiyat onunla müsəlman kimi deyil, kafir kimi müamilə etməyi gərəkdirir. Bu da o insanlara yaşadığı darın hökmü ilə hökm verməkdən irəli gəlir. Bu məsələ ilə bağlı Nisa surəsi 94-cü ayənin təfsirinə baxmaqda fayda vardır. Uca Allah buyurur:

*“ **Ey iman gətirənlər! Allah yolunda döyüşə çıxdığınız zaman (kiminlə vuruşacağınızı) yəqin edin və sizə salam verən şəxsə, dünya həyatının fani mənfəətinə can ataraq:” Sən mömin deyilsən!”-deməyin. Allah yanında çox qənimətlər vardır. Əvvəllər siz də belə idiniz, Allah sizə mərhəmət göstərdi. Odur ki, yəqin edin! Şübhəsiz ki, Allah nə etdiklərinizdən xəbərdardır.”***

İbn Abbas (r.a) deyir ki, “ Bəni Səlim qəbiləsindən olan bir kişi öz qoyunları ilə Peyğəmbərin (sallahu aleyhi və səlləm) səhabələrindən ibarət kiçik bir dəstənin yanından keçərkən onları salamladı. Onlar isə: “Qorxduğundan bizə salam verdi”-

deyərək, onu öldürdülər. Sonra həmin kişinin qoyunlarını götürüb Peyğəmbərin (sallallahu aleyhi və səlləm) yanına gəldilər. Allahu Təala bu ayəni nazil etdi.”

(Buxari, 3208; Muslim, 2643)

Digər bir rəvayətdə isə: Miqdəd bin əl-Əsvədin (r.a) iştirak etdiyi bir dəstə Peyğəmbərin (sallallahu aleyhi və səlləm) əmrinə əsasən gəlib bir tayfanın yanına çatdılar. Lakin onlar çoxsaylı malından ayrılmamış bir kişidən başqa hamının qaçdığını gördülər. Kişi onları görən kimi: “Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan haqq məbud yoxdur ”-dedi. Miqdəd(r.a) hücum çəkərək onu öldürdü. Səhabələrdən biri: “Sən Allahdan başqa ibadətə layiq olan haqq məbud yoxdur deyən bir kəsimi öldürdün? Allaha and olsun ki, bunu Peyğəmbərə (sallallahu aleyhi və səlləm) xəbər verəcəyəm.”-dedi. Onlar geriyə döndükdə: “ Ey Allahın Rasulu, bir nəfər şəhadət gətirdiyi halda

Miqdəd onu öldürdü.” Peyğəmbər (sallallahu aleyhi və səlləm): “ Ey Miqdəd, sən Lə İləhə İlləllah deyən birinimi öldürdün? Bəs Qiyamət günü o bu şəhadət ilə gəldikdə sənin halın necə olacaq? “ Allahu Təala da bu ayəni nazil etdi: “ Ey iman gətirənlər! Allah yolunda döyüşə çıxdığınız zaman yəqin edin və sizə salam verən şəxsə, dünya həyatının fani mənfəətinə can ataraq: “Sən mömin deyilsən!” -deməyin. Allah yanında çox qənimətlər vardır. Əvvəllər siz də belə idiniz, Allah sizə mərhəmət göstərdi. Odur ki, yəqin edin! Şübhəsiz ki, Allah nə etdiklərinizdən xəbərdardır.” (ən-Nisa, 94). “O kafir bir qövmün yanında imanını gizlədən bir kişi idi. İmanını üzə çıxardıqda sən onu öldürdün. Axı sən də bundan qabaq Məkkədə imanını gizlədirdin.”

(Məcmuuz-Zəvaid 7/66, əl-Heysəmi, 10943).

Bu haqda digər bir rəvayət isə belədir:

“ Abdullah ibn Hədrəd rəvayət edir ki, Peyğəmbər (sallallahu aleyhi və səlləm) bir dəstə müsəlmanı İdəmə göndərdi. Əbu Qətadə Haris bin Ribi və Müxəlləf bin Cəssamə bin Qeys və mən də onların arasında idim. Biz orada olarkən Amir əl-Əşcəi bizim yanımızdan keçdi və bizə salam verdi. Onun dəvəsinin üstündə bir tuluq süd və başqa şeylər də var idi. Müxəlləf bin Cəssamə onu öldürüb dəvəsini və onun üstündəki yükü götürdü. Biz Peyğəmbərin (sallallahu aleyhi və səlləm) yanına gəldikdə, bu haqda Ona xəbər verdik və Allahu Təala bu ayəni nazil etdi:

“ Ey iman gətirənlər! Allah yolunda döyüşə çıxdığınız zaman..”

(Muntəqa, İbn Carud)

Bu ayələrin nüzul səbəbinə fikir verin. Adam sadəcə salam vermiş, digər rəvayətdə isə Lə İləhə İlləllah demişdi. Bununla belə öldürülmüşdülər. Hadisənin baş verdiyi yer də darul-hərbdir. Əgər bu ada-

mın dediyi söz İslamına əlamət olmasaydı, Peyğəmbər (sallallahu aleyhi və səlləm) Miqdədə axirət həyatını xatırladıb bu cür qarşılıq verməzdi. Ayədə isə açıq olan İslamını izhar edən şəxsə kafir demənin qadağan olmasıdır. Onlara düşən isə onunla müsəlman kimi müamilə etmək idi. Çünki o adam küfrünü deyil, islamını izhar etmişdi. Əgər Əbu Hənzələnin dediyi kimi darul-küfrdə insanlara darın hökmü ilə müamilə etmək doğru olsaydı, Peyğəmbər (sallallahu aleyhi və səlləm) bundan dolayı səhabəsini qınamazdı.

Bu ayə ilə bağlı Hafiz ibn Həcər (r.a) belə deyir:

" Ayət, İslamın əlamətlərindən birini üzərində daşıyan kişinin, durumu özündən soruşulub araşdırma edilmədən öncə öldürülməyəcəyinə dəlildir. Çünki salam vermək, möminlərin əlaməti olduğu kimi, cahiliyyə dövründə də yayğın olan bir salamlama növü idi. Ancaq salam vermək

tək başına kişini müsəlman olduğuna hökm etmək və ona İslamın hökmlərini tətbiq etmək üçün yetərli deyil. Kişinin Müsəlman olduğuna hökm etmək üçün şəhadət kəliməsini müsəlmanların dediyi kimi deməsi lazımdır.”

( Fəthul-Bari, Kitabut-təfsir, bab: 17)

Muhəmməd bin Həsən əş-Şeybani belə deyir:

“ Müsəlmanlar, müşriklərin şəhərlərindən birinə qüvvət yolu ilə girərlərsə, gördükləri Müsəlman və ya zimmət əhli siması daşıyan bir kişini öldürmələri xaricində, orada olanları öldürmələrində bir problem yoxdur. Ancaq üzərində Müsəlman siması daşıyan birini gördüklərində onun kimliyini araşdırmaları lazımdır.”

Bu cümləni şərh edən Səraxsi belə deyir :

“ Çünki həqiqəti bilinməyən şeylərdə simaya görə hökm vermək vacibdir. Allahu Təala bəzi ayələrdə belə buyurmaqdadır: “ Əlamətləri isə üzlərindəki səcdə izidir”

(əl-Fəth, 29), “ Sən onları üzlərindən tanıyırsan”.(əl-Bəqərə, 273) Yanlışlıqla öldürməyi önləmək mümkün deyil. Ələ keçirilən kişinin kimliyinin diqqətlə araşdırılıb dəqiqləşdirilməsinə qədər gözləmək isə Müsəlmanlara zərər verməz. Çünki ehtimal ifadə edən sima, fasiq bir kişinin gətirəcəyi xəbərdən daha aşağı deyildir. Fasiq bir xəbər gətirdiyində araşdırma aparmaq əmr edildiyi kimi, bu cür simalarda da gərəkli araşdırma aparmaq məcburiyyəti vardır.”

(Şərhul- Siyəril-Kəbir, 4/1444)

Qeyd etdiyimiz ayələr və onunla bağlı şərhlərdə də deyildiyi kimi salam vermək bir insanın müsəlman olması üçün əsas əlamət olmasa belə, bu salam onun öldürülməsinə bir maneədir. Hətta bunu araşdırıb bu kişinin salamının müsəlmanlığınınmı, ya küfrününmü bir gərəkçəsi olduğunu ortaya çıxarıncaya qədər gözləmək lazımdır. Bəs namaz necə? Axı bu

əməl küfrlə İslam arasında bir sərhəd olaraq göstərilmişdir. Bir hədisi burada qeyd etmək yerinə düşər.
“ Mihcən əd-Deyli (r.a) atası haqqında rəvayət edir ki, “ Atası Mihcən Rasulullahın (sallallahu aleyhi və səlləm) yanında idi. Bu vaxt namaz üçün əzan oxundu. Rasulullah (sallallahu aleyhi və səlləm) qalxdı, namaz qıldı və döndü. Mihcən hələ də yerində idi. Ona belə dedi: “Camaatla namaz qılmana mane olan nədir, sən müsəlman deyilsənmi?“. Mihcən dedi: “ Əlbəttə müsəlmanam, ancaq mən ailəmlə namazımı qılmışdım! “. Rasulullah (sallallahu aleyhi və səlləm) ona belə dedi: “ Məscidə gəldiyin zaman namaza qalxarlarsa, qılmış olsan belə camaatla birlikdə sən də namaz qıl.”
(Malik, Əhməd, Nəsai, Hakim)

Digər ayələrə də baxaq. Allahu Təalanın kitabında möminlərin sifətləri haqda olan

bütün ayələrdə də namaz İslam əlaməti kimi zikr olunur.

“ ***Əgər tövbə etsələr, namaz qılıb zəkat versələr, onlar sizin din qardaşlarınızdır. Biz ayələri bilən adamlara belə izah edirik.”*** (ət-Tövbə, 11)

“ ***Halbuki onlara, dini məhz Allaha məxsus edərək, həniflər kimi ibadət etmək, namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur.”*** (əl-Bəyyinə, 5)

Buna bənzər ayələr çoxdur. Bu ayələri gətirməkdə məqsəd budur ki, namaz Tövhiddən sonra İslamın əsas dayağıdır. Əgər bir insanın namazı onu müşriklərdən ayıran bir əlamət deyilsə, o zaman namazı tərk edənin təkfir olunmasında fayda nədir? Namaz qılan da, qılmayan da zahirən eyni hökmdədirsə, o zaman nəyə görə namaz qılmayan bir kəsi təkfir edirsiniz? Sizin etiqadınıza görə namaz dinin furusundadır, məgər furuatdan olan bir şeyə

görə insanları təkfir etmək olarmı? Murciyələr deyir ki, biz bir kəsin zahirində böyük küfür görsək, onun bu küfrə etiqad edib-etmədiyini bilmədikcə, ancaq və ancaq bu əməl səbəbi ilə onu təkfir etmərik. Siz isə deyirsiniz ki, biz bir kəsin zahirində bir İslam əlaməti görsək də belə, onun etiqadını bilməsək, ona müsəlman kimi baxmarıq. İndi siz deyin bu qayda ilə siz murciyədən nə qədər fərqlənirsiniz. Hər ikiniz adamın zahirini deyil, etiqadını əsas tutursunuz. Etiqad isə qəlbə aid olan bir şeydir. Amma bilindiyi kimi dində bizə düşən insanların zahiri ilə müamilə etməkdir. Necə ki, həzrəti Ömərin dediyi kimi, nə qədər  Peyğəmbər (sallallahu aleyhi və səlləm) aramızda idi biz insanlarla vəhyə görə müamilə edirdik. Elə ki, o vəfat etdi, vəhy kəsildi, biz artıq insanlarla zahirlərinə görə müamilə edərik. Əgər zahirlərində İslam varsa, müsəlman kimi, küfr varsa, kafir kimi davranarıq.

Bu sözlər həzrəti Ömərin dində necə fəqih olduğunu göstərir. Amma bu gün bu sözlərdən ilham alan bəzi cahillər adamın zahirində olan saqqal, isbal kimi əlamətləri müsəlmanın deyil, kafirin əlaməti olduğunu, qadınlarda hicab və niqabın da həm müsəlmanlara, həm də kafirlərə aid olduğunu düşünərək, onunla müsəlman müamiləsi etmək üçün yetərli olmadığını deyirlər. Burada bir vacib məsələ var ki, bunu unutmayın! Biz nə saqqalla, nə isballa, nə niqabla bir kəsin İslama girdiyinə etiqad etmirik. Lakin bu əlamətləri birində gördüyümüz zaman, bunu ən azından onun küfrünə deyil, islamına aid edirik. Axı bu qaydanı özünüz də qeyd edirsiniz ki, usulu-fiqhdə hökm ğalib olana görə verilir, nadir olana görə deyil. Bu əməllər İslamın əmr etdikləridir, küfür dininin deyil. Hansısa bir kafir namaz qılırsa, saqqal və isbal saxlayırsa və ya niqab bağlayırsa, bu əməlini özünü küfrə aid

etdiyi üçün deyil, İslama aid etdiyi üçün edir. Bir kəs bu ibadətləri yerinə yetirdiyi halda, həm də küfr dininin gərəyi olan işləri edirsə, bu əməl İslamdan çıxaran əməldirsə, biz onun namazına görə küfrünü görməzdən gəlmərik. Çox zaman bizə qarşı danışanlar elə bilirlər ki, biz küfr əməli edənlərin namazına görə küfrlərinə göz yummağı müdafiə edirik. Əsla! Bizi tanıyan hər kəs əqidəmizin nə olduğunu yaxşı bilir. Sadəcə biz deyirik ki, bizim üçün halı qapalı olan, mücərrəd, məchul kişiləri, müşriklərin də namaz qılmaları gərəkçəsi ilə təkfir etmərik. Siz isə məchul olanla məruf olanı, halı qapalı olanla, halı məlum olanı bir-birindən ayırmadan sadəcə və sadəcə namaz qıldığına görə adamın haqqında küfr hökmü verirsiniz. Belə bir mənzərə düşünək, zahirində saqqalı, isbalı olan biri gəlib müsəlmanların heyvan kəsib satdığı bir ət dükanından ət alır. Və namaz sırası gəldiyində

müsəlmanlarla bir yerdə namaz qılır və qibləyə də yönəlir. Onda heç bir küfür və şirk əməlini etdiyi görülmür. Bunu da qeyd edim ki, adam heç birimizin tanımadığı bir kəsdir. İki nəfər bu adam haqda mübahisə edir. Biri deyir ki, mən bunun haqda hökm verərkən Peyğəmbərin (sallallahu aleyhi və səlləm) hədisi ilə əməl edirəm: " Kim bizim qıldığımız namazı qılar, bizim qibləmizə yönələr, kəsdiyimizi yeyərsə, bu kimsə müsəlmandır." Bu adam hər üç əməli yerinə yetirdiyi üçün mən onu müsəlman adlandırıram. Digəri isə deyir ki, mən onun qıldığı namaza etibar etmirəm, ta ki, onun əqidəsini bilməyincə onun haqqında yaşadığı ölkənin hökmü ilə hökm verirəm. Bu vəziyyət yaşadığımız günlərdə bəzilərinin mənhəcidir. İndi siz deyin bunların hansı Allahın hökmünə daha uyğundur? Peyğəmbərimizin (sallallahu aleyhi və səlləm) bu hədisi nasdır və nəsx olunmayıb. Bunu kimsə

nəsx edə bilərmi? Yoxsa Peyğəmbərimizin zamanında din olan şey bu gün din deyil? İddia edirsiniz ki, biz hədisin zahirinə, ləfzinə sarılmışıq, siz isə məfhumu götürürsünüz. Məgər nassın zahiri ilə məfhumu bir-birindən ayrıdır? Onun zahirini şəriət olaraq buyuran Allah və Onun Rasuludur. Uca Allah buyurur:

***“O öz istəyi ilə danışmır. Bu ona təlqin edilən bir vəhydir.”***

(ən-Nəcm, 3-4)

Nassın zahirini deyil, məfhumunu araşdıranın isə sözü hər bir halda divara çırpılmağa layiq olan insandır. Nassın zahirindən ona müxalif olan məfhum çıxaran hər bir kəs bununla Allah və Rasulunun sözünü yalanlamış olur ki, hətta bunu qəsd etməsə belə. Çünki bir ayənin və ya hədisin ən böyük məfhumu elə onun zahirindədir. Əgər ayə və ya hədisin zahiri mütəşabihdirsə, o zaman daha möhkəm olan nassa yapışmaq lazımdır. O

da yoxdursa, o zaman ləfzə ən yaxın olan məfhum ilə bunu başa düşmək lazımdır. Məncə bu haqqa ən yaxın olandır.

Əgər Peyğəmbər (sallallahu aleyhi və səlləm) namazı kafirlə müsəlmanı bir-birindən ayıran bir sərhəd olaraq tanımışsa, sizin dəliliniz nədir ki, onu bu statusdan çıxarasınız. Hədisdə deyilir: " Bizimlə onlar arasındakı fərq namazdır. Kim namazı tərk edərsə, kafir olar."

(Əbu Davud, Nəsai, Tirmizi, İmam Əhməd)

" Kişi ilə küfr və şirk arasında namazın tərki vardır ".

(Muslim)

Qurtubi (r.a) belə deyir:

" İman, Lə İləhə İlləllah və namaz olmadan olmaz. İshaq bin Rahaveyh belə deyir: Namaz haqdakı icma kimi başqa bir mövzuda ittifaq edilməmişdir. Çünki kafir olaraq bilinən bir kişinin daha sonradan beş vaxt namazı vaxtında qıldığı araşdırıl-

dığında dili ilə iki şəhadəti iqrar etdiyi bilinməsə də, mömin olduğuna hökm edilir. Halbuki oruc və zəkat üçün eyni hökm verilməmişdir.”

(əl-Cali li Əhkəmul-Quran, 8/207)

İbni Qudamə (r.a) “Kitabul-İmamə” bölümündə deyir: “ Əshabımız istər darul-hərbdə, istərsə də darul-İslamda olsun, kişinin tək başına və ya camaatla namaz qılması səbəbi ilə onun Müsəlman olduğuna hökm etdilər.” Daha sonra isə Rasulullahdan (sallallahu aleyhi və səlləm) “ Bizim ilə onlar arasındakı fərq namazdır, kim namazı tərk edərsə, kafir olar” hədisini zikr edir və belə davam edir: “ Namaz, iman ilə küfr arasında sərhəd olaraq müəyyən olunmuşdur. Kim namaz qılarsa, İslam sərhədi içində qalır. Çünki namaz, Müsəlmanlara məxsus bir ibadətdir. Namaz qılmaq, şəhadət kəlməsi kimi İslam əlamətlərindəndir.”

"Kitabul-Mürtəd" bölümündə də belə deyir: "Namazı qılmasına baxmayaraq, bir fərzi və ya Peyğəmbəri və ya Kitabı inkar etmək ilə ya da bəzilərinin işlədiyi dindən çıxaran bir bidəti işləmək ilə küfrə girmiş isə, sadəcə namaz qıldığı üçün Müsəlman olduğuna hökm edilməz."

Bu haqda şeyx Məqdisi belə deyir:

***"Qəti olaraq bidiyimiz və inandığımız budur ki, İslamın mötəbər əlamətlərindən birini izhar edən kişinin içində gizlədikləri Allahu Təalaya həvalə edilərək dünyəvi işlərdə ona Müsəlman müamiləsi edilir. Çünki kişinin içində gizlədikləri Allahu Təalaya aiddir və dünyəvi hökmlərdə bunun üzərində hökm bina edilməz. Onu İslamdan çıxaracaq bir söz demədiyi və ya bir əməl etmədiyi müddətcə, bu cür kişilərin arxasında namaz qılınır, ona salam verilir və kəsdiyi də yeyilir. Rasulullah (sallallahu aleyhi və səlləm) belə buyurur: "Kim bizim qıldığı-***

***mız namazı qılar, bizim qibləmizə yönələr və kəsdiyimizi yeyərsə, bu kimsə müsəlmandır.”***

***Hədisdə keçən “kəsdiyimizi yeyərsə” sözündən qəsd, İslama uyğun kəsilən heyvan ətini yeməsi deməkdir. Müşriklərin yediyi kimi ölü heyvan ətini yeməz. Buxarinin mərfu olaraq rəvayət etdiyi hədis də bunu açıqlamaqdadır:***

***“İnsanlar Lə İləhə İlləllah deyincəyə qədər onlarla savaşmaqla əmr olundum. Kim bunu söylər, namazımızı qılar, qibləmizə yönəlir və kəsdiyimiz şəkildə kəsərsə, haqq etmələri xaricində malları və canları bizə haram olur. Hesabları Allaha aiddir.”***

(Məqdisi, Otuz risalə, səh.124)

İbni Qudamə belə deyir: “Kişi, müsəlmanlığından şübhələndiyi kişinin arxasında namaz qıldığı zaman, şübhələndiyi kişinin küfrü açıq olaraq ortaya çıxıncaya qədər namazı səhihdir. Çünki müsəlman-

larda zahir olan İslamdır. Özəlliklə bu kimsə imam isə bu daha açıqdır.

( əl-Muğni, İmamət )

Buradan anlaşılan budur ki, əqidəsini bilmədiyi bir kişinin arxasında namaz qılan birisi sadəcə onun zahirində olan İslamına etibar etdiyi üçün onunla müsəlman kimi müamilə edir və müsəlmanlara aid olan haqları onun üçün də tanıyır. Bu dində ən möhkəm qaydadır. Bundan başqası isə yalnız zənn və ehtimallara dayanaraq verilən hökmlərdir. Çünki Əhli-Sünnətin iman və küfr məsələsində baxışı ifrat əhli olan xavaric və mötəziləyə, həmçinin təfrid əhli olan cəhmiyyə, murciyə və kərramiyyə firqələrinə müxalifdir.

Xavariclər deyir iman kütlə şəklindədir, artıb azalmaz. İslamdan olan bütün əməllər imanın əslindəndir, bunlardan birini tərk edən hamısını tərk etmiş kimidir. Onlara görə böyük və kiçik günahların hər biri səbəbiylə insan İslam xaricinə çıxır.

Mötəzilə isə deyir ki, böyük günah edənlər axirətdə iki mənzil arasında bir mənzildə olacaqlar. Əl mənzilu beynəl mənziləteyn fikri bu deməkdir.

Cəhmiyyə firqəsi isə iman və küfrü yalnız qəlbin bilməsinə bağlayır. Onlara görə iman yalnız bir kəsin qəlbində Allahı bilməsi ilə sabit olur. Küfr isə bunun əksidir, yəni qəlbində Allahı inkar etməsi ilə bir kəs kafir olur.

Kərramiyyə firqəsinə görə isə iman yalnız dilin əməlidir. Dillə iqrar etmək iman üçün kifayətdir. Nə qəlbin, nə də əməllərin imanda heç bir payı yoxdur. Küfr isə bir qulun dili ilə təsdiq etdiyini yalanlamasıdır.

Murciyənin fəqihləri isə deyirlər ki, iman qəlbin təsdiqi və dilin bunu deməsidir. Əməllərin imanda heç bir rolu yoxdur. Çünki iman sabitdir, artıb azalmaz. Küfr isə tam bunun əksidir. Yalnız

qəlbin təkzibi və dilin imandan olan şeyi inkar etməsidir.

Əhli-sünnət isə iman haqqında bunları deyir: İman, dillə demək, qəlblə təsdiq etmək və əzalarla bunu göstərməkdir. Artır və azalır. İtaətlə artır, asiliklə azalır. İman şöbələrdən ibarətdir. Bəzi şöbələri imanın əslindən, bəzisi vacibindən, bəzisi də müstəhəbindəndir. İmanın əslindən olan bir şeyi tərk etməklə insan İslamdan çıxır. Lakin vacibini tərk etməklə isə insan böyük günah sahibi olur. Müstəhəbdən olan bir şeyi tərk etməklə isə insan heç bir günah qazanmır.

Bunlar iman və küfr məsələsində firqələrin və Əhli-Sünnətin görüşləridir. Bunların heç birində İslamdan olan bir əməli edən birinin bununla kafir olduğu yoxdur. Əksinə cəhmilərə görə imanda vacib olan qəlbdir. Dilin və əməllərin imanda rolu yoxdur. Bütün " Navaqidul-İslam " bablarına baxsanız, heç birində nə

darul-hərbdə, nə də darul-İslamda namaz qıldığı üçün insanın kafir olduğunu və ya bununla İslam və küfr arasında olduğunu bəyan edən bir dəlil yoxdur. Əksinə namazı tərk etdiyi üçün insanın kafir olduğu haqda kifayət qədər dəlil vardır. Şeyx Məqdisi bu haqda belə deyir:

“ Yuxarıda qeyd etdiklərimizdən belə anlaşılır ki, küfür, imanın əslindən olan hər hansı bir şeyin tərk edilməsi ilə meydana gəlsə də, dünya əhkamında ancaq imanın əslindən olub dil və orqanların sorumlu olduğu ünsürlərdən biri səbəbi ilə meydana gəlir. Çünki dünya əhkamında qəlbin əməllərinin bir rolu yoxdur və verilən hökmlər ancaq zahirə görə verilir. Qəlbin əməlləri isə bizim bilmə imkanımız olmayan şeylərdir və ancaq söz və ya əməl ilə zahirən ortaya çıxması ilə bilinə bilir. Bilindiyi kimi şəriət, dünya əhkamında şəri hökmlər üçün açıq səbəblər və təsbit edilə bilən zahiri

illətlər qoymuşdur. Qəlblərin dərinliklərində olanlar isə, qeyb olub təsbiti mümkün deyildir. Buna görə qəlbin əməllərinin bizim ilə əlaqəsi yoxdur və bunlar Allahu Təalanın əmrinə buraxılmışdır.”

(Məqdisi, Otuz risalə, 254)

İbni-Həcər (r.a), “ Dinini dəyişdirəni öldürün” hədisindən söz edərkən belə deyir: “ Hədisdə keçən “Mən” ibarəsi ümumidir. Ancaq batini olaraq dinini dəyişdirdiyi halda, zahirən bu durumu ortaya çıxmamış olan kişinin durumu fərqlidir. Çünki kişilər haqqında verilən hökmlər ancaq zahiri səbəblərə görədir.”

İbni Həcər Allahu Təalanın “***Onlar andlarını sipər edib insanları Allah yolundan döndərdilər”*** (əl-Münafiqun, 2) ayəsini qeyd etdikdən sonra belə davam edir: “ Bu da göstərməkdədir ki, imanı izhar etmək , kişini öldürülməkdən qurtarır. Hər kəs dünya hökmlərinin zahirə görə

veriləcəyi və qəlblərdə gizlədilənlərin isə Allahu Təalaya aid olduğu haqda icma etmişdir. Rasulullah (sallallahu aleyhi və səlləm) , Usamaya “Onun qəlbini yarıb baxdınmı!” demişdir. Yenə bir kişini öldürmək istəyən kimsəyə “ O namaz qılırmı ?” deyə soruşmuş və izn istəyən kişi “Bəli” deyincə , “ Mənə beləlerini öldürmək qadağan edildi.” demişdir. Bu hədis də bu qəbildəndir. Xalid bin Vəlid (r.a), qənimət bölgüsündə narazı qalan bir kişini öldürmək üçün  Rasulullahdan (sallallahu aleyhi və səlləm) izn istəmiş və belə demişdi: “ Qəlbində olmayanı dili ilə söyləyən nə qədər namaz qılanlar vardır”.Bunun cavabında Allah Rasulu (sallallahu aleyhi və səlləm)  ona belə dedi: “ Mən insanların qəlblərini araşdırmaqla əmr olunmadım”. Bu hədisi Müslim təxric etmişdir və bu mənada olan bir çox hədis də mövcuddur.

(Fəthul-Bari,“İstitabətil-Mürtəd” bölümü)

Göründüyü kimi dünya hökmləri yalnız zahiri əlamətlərə görə verilir. Qəlblərə aid olan etiqadları araşdırmaq isə bizim üzərimizə fərz deyildir. Çünki qəlbə baxmaq ancaq Allaha aiddir. Bir kişidə zahiri bir küfr yoxdursa, əksinə İslamını göstərən qərinələr mövcuddursa, bizim üzərimizə düşən ondan bir küfr və şirk ortaya çıxıncaya qədər onunla müsəlman kimi davranmaqdır.

Bu haqda Şeyx Abdulqadir bin Abdulaziz belə deyir:

“ Kim bizim qıldığımız namazı qılar, bizim qibləmizə yönələr və kəsdiyimizi yeyərsə, bu kimsə müsəlmandır” hədisini zikr etdikdən sonra belə deyir : “ Bu kimsə hökmən müsəlmandır. Belə bir kimsə halı qapalı olan müsəlman adlanır. Bu, özündə müsəlmanlıq əlamətlərindən biri görünüb, İslamı pozan hər hansı bir

əməlinə şahid olunmayan kimsədir. Çünki müsəlmanlıq əlamətləri zahiri səbəblər olub, şəriət, sahibinə Müsəlman hökmünü verməyi bu səbəblərə bağlamışdır. Elə isə bu kimsə üçün Müsəlman hökmü sabit olur. Ancaq İslamı pozan bir davranışda olmaq kimi daha qüvvətli bir zahiri hal, bu hal ilə zidd olarsa, hökm buna görə verilir. İslamı pozan bir halına şahid olunmayan kimsə üçün İslam hökmü sabitdir.”

(əl-Cami, İman və küfr bölümü)

Yenə bu barədə şeyx Məqdisi deyir:

“ Həqiqi iman, haqqında Allahu Təalanın hökm verəcəyi batini işlərdəndir. Allahu Təalanın yanında, savab və cəza kimi axirət hökmləri buna binaən verilir.

Hökmü iman isə, kişinin zahirən ortaya qoyduğu imandır. Müsəlman ilə kafir bunun ilə bir-birindən ayrılır. Malı və qanı toxunulmaz edən hökmü İslam ilə eyni anlamlıdır. Şəhadət kəlməsini söyləmək ya da buna bənzər İslam əlamətlərindən

birinin yerinə yetirilməsi və bununla birlikdə İslamı pozan hər hansı bir səbəbin də olmaması ilə kişi haqqında sabit olur.”

(Şeyx Məqdisi, Otuz risalə, 258)

Bu sözlərdən də göründüyü kimi insanlarla zahiri əlamətlərinə görə müamilə etməyin faydası budur ki, bu müsəlmanlar haqqında yanlış zənn etməyin qarşısını alır və dünya əhkamına görə zahirən müsəlman olan axirətdə kafir də olsa, kişi bu müamiləni etdiyi üçün savab qazanır.Çünki o bu münasibətdə zahiri əsas aldığı üçün İslam əhkamına tabe olmuşdur. Belə olmasaydı münafiqlərin zahirən müsəlman olması və Rasulullahın da (sallallahu aleyhi  və səlləm) onlarla müsəlman kimi davranmasının heç bir əhəmiyyəti qalmazdı. Halbuki O, münafiqlərin adını bütün ümmətə deyil, yalnız Huzeyfəyə(r.a) bildirmişdi. O zaman ortaya belə bir məsələ çıxır ki, münafiqləri tanıdığı halda, onların adlarını ümmətə

bildirməməklə Allah Rasulu (sallallahu aleyhi və səlləm ) səhabəsini kafirlərlə müsəlman müamiləsi etməyə məcbur buraxmışdır. Və ya şəri baxımdan bilinməsi vacib olan bir məsələ haqda ümmətə xəbər verməmişdir. Allah qorusun. Bu açıq-aşkar bir iftiradır.Bəs onda nəyə görə Rasulullah (sallallahu aleyhi və səlləm) münafiqlərin adlarını gizli saxlayır və müsəlmanların onlarla müsəlman müamiləsi etməsinə mane olmurdu? Demək buradan bir nəticə çıxır ki, münafiqlərin küfrü vəhylə sabit olduğu halda, Rasulullah (sallallahu aleyhi və səlləm) onlarla batinlərində gizlədikləri ilə deyil, zahirlərində olan İslamları ilə müamilə edir və müsəlmanlara da bu uca hikməti öyrədirdi. Halbuki insanların içərisində Allahdan ən çox qorxan Allahın Rasulu idi. İndi necə olur ki, bu gün bu qayda keçərsiz olur və biz insanların kimliyini bilmək üçün mütləq onların batinlərində

olanları üzə çıxarmalıyıq. Bizə belə deyə bilərlər ki, onlar heç kimin batinini araşdırmırlar, sadəcə namazdan qabaq əsas şərt olan Lə İləhə İlləllah şərtinin bu cür insanlarda sabit olub olmadığını bilib və sonra onların namazlarına müsəlmanlıqları üçün şərt kimi baxırlar. Çünki bu günün vaqeəsi, namaz qılan bir çox kişinin etiqadının pozuq olduğudur. Və İslamın birinci şərti olmadan, cadəcə və sadəcə qılmış olduğu namazla haqqında müsəlman hökmünü verməyimiz doğru olmaz. Biz isə onlara belə deyirik: " Allah Rasulunun (sallahu aleyhi və səlləm) vəhylə etiqadlarını bildiyi ( halbuki siz vəhylə deyil, yalnız ehtimal və zənnlə onların etiqadını təyin edirsiniz) münafiqlərlə müsəlman kimi davranır və səhabənin də onlarla bu cür davranmasına mane olmurdu.

Bu cür kişilərin etiqadlarına gəldikdə isə, müxaliflərimiz sırf mürciyə camaatından

olduğu üçün bu insanları təkfir etdiklərindən dolayı elə bir zənndədirlər ki, bu gün saqqal saxlayan insanların çoxu murciyədir və onlar tağutlar tərəfindən təyin edilmiş imamların arxasında namaz qılırlar, bu səbəblə də onlar imamlarının etiqadındadırlar. Ona görə də bu insanlar Kəlimeyi-şəhadəti söyləsələr də, namaz qılıb dinin fərzlərini yerinə yetirsələr belə bu onların İslamları üçün yetərli deyil. Çünki onlar bu şəhadətlə nəyi qəsd etdiklərinin fərqində deyillər.

Bu təbii ki, təkfir üçün yetərli olmayan səbəblərlə təkfir etmək və hava və həvəsdən qaynaqlanan bir ehtimalı şəriətin qəti dəlillərinin önünə çıxarmaqdır. Bu haqda şeyx Əbu Asim əl-Məqdisi (hafizəhullahu Təala) belə deyir:

" Özəlliklə təkfir edilib edilməmələri haqqında ixtilaf edilən bu tağut və onun dəstəkçilərinin çoxu, İslamdan təbərri etdiklərini açıq söyləməməkdə, namaz qıl-

maqda, həccə getməkdə və şəhadət kəlimələrini iqrar etməkdədirlər. Onların bu durumu, bir çox insan üçün, onların təkfirləri haqqında problemə səbəb olmaqdadır. Dolayısı ilə bunların küfrü, İslamdan ayrılıb başqa bir dinə girdiyini açıq söyləyən mürtədin küfrü kimi və ya avamdan olan heç bir müsəlmanın təkfirləri haqqında şübhə belə etmədiyi Nəsranilərin küfrü kimi açıq deyildir. Bu səbəblə bunların durumu açıqlanmağa möhtacdır.

Hətta bu məsələ, bir çox fəzilətli kişilər üçün belə müşkül olmuşdur. Məsələn, Əbu Bəkir (r.a), İslam ilə bütün əlaqələrini kəsməyib, sadəcə zəkat verməyi rədd edən mürtədlər ilə savaşmağa qərar verdikdə, Ömər ibn Xattab (r.a) buna qarşı çıxmış və “ Rasulullah (sallallahu aleyhi və səlləm) : “İnsanlarla Lə İləhə İlləllah deyincəyə qədər onlarla savaşmaq mənə əmr edildi. Bunu dedilərmi, məndən mallarını və canlarını qorumuş olurlar. İsla-

mın haqqı xaric. Artıq hesabları Allaha aiddir" dediyi halda, sən insanlarla necə savaşa bilərsən? " demişdi. Əbu Bəkir (r.a) :
" Allaha and olsun ki, namazla zəkatın arasını ayıranlarla savaşacağam. Çünki zəkat malın haqqıdır. Vallahi, onlar Rasulullaha ( sallallahu aleyhi və səlləm) verdikləri bir oğlağı verməkdən vaz keçsələr, onu almaq üçün onlarla savaşacağam." dedi. Ömər sonralar demişdi ki, " Allaha and olsun ki, anladım ki, Əbu Bəkrin bu görüşü, Allahın savaş məsələsində ona ilhamından başqa bir şey deyildi. Anladım ki, bu qərar haqlı imiş." (Buxari və Müslüm)

Rasulullahın (sallallahu aleyhi və səlləm) haqqında , " Sizdən öncəki ümmətlərdə muhaddəslər (yəni ilham verilmiş) kimsələr var idi. Əgər ümmətimdə beləsi varsa, o da Ömərdir" dediyi Ömər ibn

Xattab (r.a) üçün belə bu məsələ müşkül olmuşdursa, başqaları üçün necə olmasın!

Rasulullahdan (sallallahu aleyhi və səlləm) sonra bu ümmətin ən təqvalısı və dini haqqında həssas olan Əbu Bəkir (r.a), mürtədlərlə ilə savaşma haqqında dayandığı və onunla dartışdığı üçün Öməri təkfir etməmişdir. Çünki onun bu etirazı, şübhə səbəbiylə olmuşdur. Şəhadət kəliməsini söylədikləri üçün müsəlman olduqlarına və həm mallarının, həm də canlarının bundan dolayı toxunulmaz olduqlarına inanırdı.”

( Şeyx Məqdisi, Otuz risalə, səh, 416)

Şeyxin bu dəyərli sözlərinə diqqətlə fikir verməniz lazımdır. Əvvəldə qeyd etdiyim kimi, bu cür ehtimallarla haqqlarında müsəlman hökmünü vermədiyiniz insanların etiqadının nə olduğunu bilmədən sadəcə, çoxluq öz imamlarının etiqadındadır, deyərək, onları təkfir etmək sələfin mənhəci deyil. Əgər sırf əqidələrini bilmək istə-

yirsinizsə, özünüz də bilirsiniz ki, artıq bu insanların çoxu tağutların küfrlərini bilib onlardan təbərri edənlərdir, sadəcə məscid imamlarının təkfir olunub olunmaması məsələsində bizimlə ayrılırlar. Bu isə onları küfrə soxacaq dərəcədə bir əməl deyildir. Əgər siz “ Kafirləri təkfir etmə-yən təkfir olunur “ qaydasına görə hərəkət edirsinizsə, bu artıq məsələnin başqa tərəfidir.

Bu qayda bu günlərimizdə çox məhşur olan bir qaydadır. Amma təəssüflər olsun ki, bunu sələf imamlarının hansı qəsdlə dediyi, kimlərə tətbiq etdiyi məsələsi qulaqardına vurulan bir hala gəlmişdir. Əvvəlcə baxaq görək bu qaydanı qoyan alimlər özləri bunu necə tətbiq etmişlər. Və həmçinin xüsusən vurğulamaqda fayda vardır ki, bu qayda nə Quran ayəsi, nə hədis, nə də üzərində icma olunan bir görüşdür. Bu sələfin bəzi imamlarının avamdan olan müsəlmanları zındıqların

dinə soxduqları şübhələrdən çəkindirməsi üçün söylədiyi bir qaydadır. Bu hər zaman küfrün, şirkin və fısqın qapısını birdəfəlik qapatmaq üçün Peyğəmbərimizin (sallallahu aleyhi və səlləmin) işlətdiyi bir üsuldur. Necə ki, “ Bizə silah qaldıran bizdən deyildir” , “ Yalan danışan bizdən deyildir” , “ Müsəlmanı söymək fısq, onunla savaşmaq isə küfrdür” və sair hədislərdə işlədilən bu metod müsəlmanları bu cür günahlara düşməkdən çəkindirmək üçündür. Əgər bununla bu insanların kafir olduqları qəsd olunmuş olsaydı, o zaman “ İki mömin tayfa savaşarsa...” ayəsinin heç bir anlamı qalmazdı. Bu Allahu Təalanın Quranda işlətdiyi üslublardan biridir. Necə ki, Allahu Təala buyurur:

“ Zinaya yaxınlaşmayın. Çünki bu iyrənc bir əməl və murdar bir yoldur.” ( əl-İsra , 32)

Allahu Təala zinanın iyrənc bir əməl olduğuna görə, ona aparan yolu belə qadağan edir. Amma şəriət zinanı yalnız tənasül orqanın əməli olaraq tanımışdır. Həddi gərəkdirəcək zina yalnız kişinin cinsiyyət üzvünün qadının cinsiyyət üzvünə daxil olmasından sonradır. Belə olduğu halda AllahuTəala buna aparan yolu qadağan etməklə, bu günaha düşməkdən çəkindirir.

Əvvəldə qeyd etdiyim Əbu Bəkr və Ömər arasında keçən zəkatı verməyənlər haqda olan ixtilaf onların bir-birini təkfir etməsinə gətirib çıxarmadı. Halbuki Hz. Əbu Bəkr zəkatı verməyənləri təkfir edirdi.

Sələflərin bəzi zalım və azğınları təkfir etmə mövzusunda ixtilafı da bu qəbildəndir. Həccacın təkfir edilib- edilməyəcəyi haqda olan ixtilaf bu haqda ən gözəl nümunədir. Sələfdən bir çoxları onu təkfir etməmiş və arxasında namaz qılmışlar.

Ancaq bəzilərinin onu təkfir etdikləri də məlumdur. Səid ibn Cubeyr: “ Vallahi kafir oluncaya qədər ona qarşı çıxmadım” sözünü, Şabinin dediyi: “ Həccac cibt və tağuta iman etmiş və Allahu Təalaya küfr etmişdir” sözünü misal gətirmək doğru olardı. Onunla belə, sələfilər Həccacı təkfir etməyənləri təkfir etməmişlər. Tavusun dediklərindən bu daha aydın anlaşılır : “İraqlı qardaşlarımızın Həccaca mömin demələrinə heyrət edirəm” Əgər kafirə kafir deməyən hər bir halda kafir olmuş olsaydı, o zaman bəzi səhabə və tabiinin Həccaca müsəlman müamiləsi edib onun arxasında namaz qılmaları onlar üçün küfrü gərəkdirəcək bir davranış olardı və onu təkfir edənlər də bu insanları mütləq təkfir etməli idilər. Biz bunun tam əksini görmüş oluruq.

“ Kafirə kafir deməyən kafirdir” qaydasını deyən alimlər belə bunun tətbiqini müəyyən şərtlər çərçivəsində qeyd

etmişlər.İlk növbədə bununla qəsd olunan haqlarında Quran və Sünnətin kafir dediyi nəsrani, yəhudi və məcusilərdir. Çünki onları təkfir etməyənlər nassı yalanlamaqla küfrə girmiş olurlar. İkincisi, haqlarında kafir olduqları ilə bağlı icma olanları təkfir etməyənlər də bu qaydaya görə kafir olurlar. Amma icmanın o adama çatdırılması şərtdir. Çünki icmanın bir adama çatmaması o adam üçün üzrdür.

Üçüncüsü və əsas olanı da bu qaydanı qeyd edən alimlər bunu müəyyən şəxs üçün deyil , mütləq/ ümumi mənada işlətmişlər. Necə ki, Quran məxluq deyənlərin kafir olduğunu, onlara kafir deməyənlərin də kafir olduğunu deyən İmam Əhməd kimi alimlər, Qurana məxluq deyən xəlifəyə və onu həbs edib döyənlərə dua etmişdir. Onlar üçün istiğfar edib haqqını halal etmişdir. İslamdan çıxmış olsaydılar, onlar üçün istiğfar etmək caiz olmazdı.

Çünki kafirlər üçün istiğfar etmək Quran, sünnət və icma ilə caiz deyildir.

İbn Teymiyyənin (r.a) səhabələr arasında ixtilaflı olan bəzi məsələlər ilə əlaqədar olaraq, Aişənin (r.a) “ Kim Muhəmmədin öz Rəbbini gördüyünü iddia edərsə, Allahu Təalaya iftira etmişdir” sözünü qeyd etdikdən sonra belə deyir: “ Aişənin (r.a) bu sözünə baxmayaraq, ona qarşı çıxan İbni Abbas və digərlərini , Allahu Təalaya iftira etmək ilə ittiham etmərik. Təkfir etmək bir cəza təhdididir. Bu sözlər, Rasulullahın (sallallahu aleyhi və səlləm) bildirdiyini yalanlamaq olsa belə, kişi İslama yeni girmiş və ya uzaq bir çöl-də yaşamış ola bilər. Belələri ancaq qəti dəlil ona göstərilməsinə baxmayaraq, yenə də öz fikrində qalarsa, təkfir edilə bilər. Kişi bəlli nassları eşitməmiş və ya onun yanında bu nasslar sabit olmamış ya da başqa nassların ona çatması səbəbi ilə

xatalı da olsa bəzi nassları təvil etmiş ola bilər."

(Məcmuul-Fətava, 3/ 148)

Sələf alimlərinin bu məsələyə yanaşmasını qeyd etməkdə fayda budur ki, onlar mütləq olaraq küfür olan şeyi müəyyən kişilərə tətbiq etmədə ehtiyatlı davranmış və mücərrəd söz və əməllərlə təkfir etməmişlər. Qaldı ki, bu gün Lə İləhə İlləllah deyib namaz qılan kişilərə, sırf murciyə camaatından olduğundan dolayı və ya tağutlara nökərlik edən məscid imamlarının arxasında namaz qılmaları səbəbiylə kafir demək daha təhlükəlidir. Çünki onun etiqadının küfr olması yalnız onun haqqında qəti dəlillər mövcud olduqdan sonra deyilə bilər. Bunlar etiqadında şübhə doğuran əlamətlər olan adamlar haqda sələfin yanaşmasıdır. Həm də bu adamlar bilinən, bəlli insanlardır. Amma bizim mövzumuz isə tanımadığın, məchul olan kişilərin kafir olduqları ehtimalı ilə

qıldıqları namazı onun İslamı üçün əlamət saymamaqdan və ona kafir müamiləsi etməkdən gedir. Halbuki bu adamların açıq olan nə bir küfrü, nə bir şirki, nə də kafirlərə xas olan bir əlaməti var. Onlar saqqal saxlayırlarsa, bu İslamın bir əmridir, bu küfrə və kafirlərə xas olan bir əlamət deyil. Hətta bu gün saqqallı kafirlər olsa belə, durum eynidir. Çünki Rasulullah (sallallahu aleyhi və səlləm) saqqalı kafir və müşriklərdən ayıran bir əlamət saymışdır. Əgər bir münafiq bu əməlləri İslam adına edirsə, bizə düşən onun zahirinə etibar etməmizdir. Amma kim belinə zünnar bağlayarsa, biz onun bu əlamətini küfr əlaməti kimi qəbul edərik. Və ya kim xaç taxarsa, yəhudilər kimi hörük saxlayarsa, bu əməli- fariqa onun zahirən kafir olduğu qənaətini təmin edər. Amma bir toplum özünü Əhli-Sünnətə nisbət edib zahirində İslama zidd olan bir əlamət daşımırsa və bu kəs bizim üçün etiqadını

bilmədiyimiz birisidirsə, onun haqqında müsəlmanlara aid bütün haqqları tanımış olarıq. Bu qayda sələfilərin ən möhkəm qaydasıdır.

Digər bir şübhə isə Darul-küfrdə insanların əsil hökmlərinin kafir olduğu və xilfını izhar etmədikcə, haqqlarında darın hökmünü tətbiq etmələridir. Xilafı isə İslamlarını izhar etmək və mənsub olduqları toplumun küfründən təbərri etdiklərini açıqca ortaya qoymaqdır.

Buna cavab verməzdən öncə bildirməkdə fayda vardır ki, bu fikirdə olan bəzi insanlar yaşadığı bölgənin ümumi hökmü ilə insanlar arasında ayrım yapmadan hər kəsi kafir görüb, sonra da o insanların qanını mübah görərək bir sıra cinayətlərə bulaşmışlar. Onların məzhəbindən olmayanlara və onlara görə insanları saptıran hər kəsə bunu etmənin caiz olduğu görüşünü müdafiə edənlərə bir neçə nəsihət etmək istəyirəm. Rasulullah

(sallallahu aleyhi  və səlləm) Vəda həccində belə deyir: “ Bu şəhərin haramlığı, bu ayın haramlığı və bu günün haramlığı kimi qanlarınız, mallarınız və ırzlarınız da bir-birinizə haramdır “, habelə Buxari və Müslimin rəvayət etdiyi hədisdə “ Bu üç kişidən başqa müsəlman bir kimsənin qanı halal olmaz: Zina edən evli kimsə, qisas olaraq öldürülən kimsə və camaatdan ayrılaraq dinini tərk edən kimsə”, yenə Buxaridə keçən “ Müsəlman kişi haqqsız yerə birinin qanını tökmədikcə dinində rahat içindədir “ və digər bu kimi hədislər müsəlmanın qanının haqqsız yerə axıdılmasının mübah olmadığı və bunu edənlər üçün böyük bir təhdid olduğunu açıq bildirir.

Buxari İbni Ömərdən (r.a) belə nəql edir: “ Haqsız yerə kişinin qanını tökmək, kişinin içinə düşdüyü və xilas ola bilmədiyi bir uçurumdur.”

Kadı İyad mühəqqiq alimlərdən belə rəvayət edir: " Muvahhid müsəlmanların qanının mübah olduğunu söyləmək təhlükəlidir. Min kafiri tərk etmədə xata etmək, yanlışlıqla bir müsəlmanın bir damla qanını haqsız yerə axıtmaqdan yüngüldür"

Şübhəyə gəlincə, əvvəlcə bir ayəni qeyd edək.

***" O kafirlər, sizi Məscidul-Hərama buraxmayan və qurbanlıq heyvanlarını qurbangaha gedib çatmağa qoymayan kimsələrdir. Əgər (Məkkədə) tanımadığınız mömin kişi və qadınları bilmədən tapdalayıb əzmək və onların ucbatından günaha batmaq təhlükəsi ilə qarşılaşmasaydınız,( Allah ora zorla girməyinizə izin verərdi). Lakin Allah istədiyini Öz mərhəmətinə qovuşdursun deyə( buna izin vermədi). Əgər onlar bir- birindən seçilsəydilər, Biz onlardan kafir olanlara***

***sarsıdıcı əzab verərdik.”*** (əl-Fəth surəsi 25 )

Ayədə o kəslərdən söhbət gedir ki, onlar fəthdən qabaq Məkkədə imanlarını gizlədib yaşayanlar və hicrət üçün bir yol tapa bilməyənlərdir. Məkkə darul-küfr olsa da, onlar orada iqamət etmişlər və imanlarını gizləmələrinə baxmayaraq, Allahu-Təala onları müsəlman adlandırmışdır. Bəs o zaman darul-küfrdə imanını açığa vuran və heç bir zahiri küfr etməyənlərə yaşadığı bölgəyə görə kafir müamiləsi etmənin dəlili nədir ? Müsəlman istər darul-İslamda, istərsə də darul-küfrdə müsəlmandır.

Allahu Təala, xata ilə Müsəlmanı öldürmənin hökmünü bildirərək belə buyurur:

***“Hər kəs səhvən bir mömini öldürərsə, bir mömin kölə azad etməli və ölənin ailəsinə qan bahası verməlidir.”*** (ən-Nisa, 92)

Allahu Təala, darul-hərbdə düşmənlər ilə birlikdə iqamət etməsinə baxmayaraq, xata ilə öldürülən kişiyə Müsəlman demişdir. Sələfdən bir qisimin, fəqihlərin və təfsirçilərin görüşü budur.
Bu ayədən göründüyü kimi, darul-küfrdə insanların ümumi hökmünü müəyyən bir insana tətbiq etməklə bir müsəlman xataya da girə bilər. Çünki darul-küfrdə bir müsəlman zəifliyindən, xəstə olmasından, qorxduğundan dolayı dinini açığa vurmaya bilər və bu onun üçün yaşadığı bölgənin hökmünü gərəkdirməz. Əgər müsəlmanlar darul-küfrdə İslamını gizlədən birisini öldürərlərsə, buna görə üzrlüdürlər. Amma Qiyamət günü hər birisi öz niyyəti üzərinə dirildiləcəklər. Möminlərin anası Aişə (r.a) belə nəql edir: "Rasulullah (sallahu aleyhi və səlləm) buyurdu: " Bir zaman gələr, bir ordu Kəbəyə hücum etmək üçün yola çıxar, bir

səhraya gəlib çatdığında tamamilə bütün ordu yerə batırılar.

Mən soruşdum:

-Ya Rasulullah, içərilərində ticarətçi və onlardan olmayanlar varkən, necə olur ki, hamısı birdən yerə batırılır?

Rasulullah (sallallahu aleyhi və səlləm) dedi:

-“ Bəli onların hamısı yerə batırılar və sonra axirətdə hamısı öz niyyətlərinə görə dirildilər.”

(Buxari, Büyü, 49; Müslim, Fitən 4/8)

Başqa bir hədisdə isə deyilir:

Cərir ibn Abdullah belə rəvayət edir:

“ Rasulullah (sallallahu aleyhi və səlləm) Hasamın üzərinə bir ordu göndərdi. Onlardan bəziləri səcdəyə qapanaraq qorunmaq istədilər. Amma dərhal öldürüldülər. Bu xəbər Rasulullaha çatdı. Bunlar üçün yarım qan diyətini ödəmələrini əmr etdi və “ Müşriklər arasında iqamət edən-

lərdən bəriyəm, onların atəşləri bir-birinə görünməməlidir” buyurdu.

(Əbu Davud, Tirmizi)

Xattabi və bəzi alimlər, Rasulullahın (sallallahu aleyhi və səlləm), müsəlman olduqlarını bildiyi halda, onlar üçün yarım qan diyəti ödənməsini əmr etməsinin səbəbi olaraq, kafirlər arasında iqamət edərək öldürülmələrinə özlərinin səbəb olmalarını bildirmişlər. ( Avnul-Məbud, 7/218)

Əgər darul-küfürdə iqamət edən kəsin hökmü dara görə verilməsi qaydası hər zaman keçərli olsaydı, o zaman bu insanlar üçün diyət ödənilməsi vacib olmazdı. Çünki bir kafirin öldürülməsi üçün diyət ödənilməsi dinə ziddir. Demək darul-küfrdə yaşayan insanların tamamına bölgənin hökmü ilə kafir müamiləsi etmək doğru deyil. Amma əgər Müsəlmanlara qarşı kafirlərin səfində yer almışsa, bu durum tamamilə başqadır. Çünki Rasulullah

(sallallahu aleyhi və səlləm) kafirlərin səfində Bədr döyüşünə çıxarılmış Abbasdan (r.a) eyni ilə digər kafirlərdən aldığı kimi fidyə almışdır. Hətta o iman etdiyini iddia etsə də. Çünki bu durumda zahir əsas alınmış və onun sözünün əhəmiyyəti qalmamışdır. Belə bir halda öldürülsə, onun hökmü zahirən kafir olduğudur. Axirət günü bir üzrü varsa, Allahu Təala onu istəyər bağışlayar, istəyərsə də əzab edər. Bir hədisi qeyd etmək yerinə düşər. İbni Abbas (r.a) rəvayət edir ki, Rasulullah (sallallahu aleyhi və səlləm): "Qiyamət günü siz ayaqyalın, lüt-üryan və sünnət olunmamış halda məhşərə toplaşacaqsınız"-dedi və bu ayəni oxudu: " Məxluqatı ilk dəfə yaratdığımız kimi yenə əvvəlki vəziyyətinə qaytaracağıq. Biz vəd vermişik. Sözsüz ki, Biz onu yerinə yetirəcəyik." (əl-Ənbiya, 104). Sonra dedi: " Əyninə ilk paltar geyindirilən şəxs İbrahim olacaq. Həmin vaxt səhabələrim-

dən bəzilərini sol tərəfə aparacaqlar. Mən (onların atəşə aparıldığını görüb) : “Səhabələrim, səhabələrim”- deyəcəyəm. Mənə deyiləcək ki : “ Sən onları qoyub getdiyin gündən sonra onlar mürtəd oldular.” Onda mən saleh qul olan İsanın (ə.s) dediyini deyəcəyəm: “ Mən onlara ancaq Sənin əmr etdiyini:“ Mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha ibadət edin”-demişəm. Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni onların arasından götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə Şahidsən. Əgər onlara əzab versən, sözsüz ki, onlar sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən”

(əl- Maidə, 117-118)

(əl-Buxari, 3349)

Bu hədisdən də göründüyü kimi zahirən müsəlman olan, axirət günü kafir də ola bilər və ya əksinə zahirən kafir olan, axi-

rətdə müsəlman ola bilər. Bu isə hökmün yalnız zahirə görə verilməsidir. Zahirləri ilə müamilə etdikləri üçün müsəlmanlar buna görə günah daşımırlar.

Bu haqda alimlərin görüşlərini zikr etməkdə fayda vardır. Çünki darul-küfrdə yaşayanların ümumi hökmünün kafir olduğunu deyən insanlar və bu mənhəclə də müsəlmanları belə təkfir etmək xatasına düşənlər unutmasınlar ki, bu görüş heç də Əhli-Sünnətin görüşü deyil, əksinə bu xavariclərə xas olan bir yanaşmadır. Şeyx Abdulqadir bin Abdulaziz, bəşəri qanunlarla hökm edilən, öncədən müsəlman olan ölkələrdəki xalqların durumunu açıqlarkən belə deyir:

" Zahiri İslam olanlar: Bu qismə girənlər hökmən müsəlmandırlar. Bunlar məsturul-hal (hal qapalı) olan müsəlmanlardır. Bunlar özlərində İslam əlamətlərindən biri olub və İslamı pozan əməllərdən birini işlədiyi bilinməyən kişilərdir. Çünki şəriət

zahirən İslama dəlalət edən səbəbləri daşıyan kişiyə müsəlman hökmünü verir. Bu səbəblə İslam hökmü onun haqqında sabitdir. Ancaq şəriət bu hal ilə bərabər İslamı pozan bir səbəbin ortaya çıxıb-çıxmadığı bilinməyən kişiyə İslam hökmü verir. Rasulullah (sallallahu aleyhi və səlləm) buyurdu ki, “ Kim bizim qıldığımız namazı qılar, qibləmizə yönələr və kəsdiyimizi yeyərsə, o müsəlmandır”. ( Buxari)

Hafiz ibn Həcər bu hədisin şərhində belə dyir: “ Hədisdən anlaşılır ki, insanlar haqqındakı hökmlər zahirlərinə bağlıdır. Hər kim bir dinin əlamətini daşıyarsa, ondan bu dinə müxalif olan bir şey çıxmadığı vaxta qədər bu dinin əhlinə verilən hökmlər bu kişiyə də verilir.” ( Fəthul-bari, 1/497)

İki qrup məsturul-hal olan müsəlman haqqında xata etmişdir:

a) Küfr iqtidarına səssiz qaldığı üçün onları təkfir edən tayfalar:

Çünki səssiz qalmaları razı olmalarına dəlildir, deyirlər. Bunların sələfləri Avfiyyə, Beyhəsiyyə xariciləridir. Bunlar deyirlər ki, Dövlət başçısı kafirdirsə, rəiyyətdən hazır və qaib olan hər kəs kafir olur. ( Məqalat əl-İslamiyyə Əbul Həsən əl- Əşari, 1/192-194)

Bu yanlış bir sözdür, üsuli-fiqhin möhkəm qaydalarından biri də budur; "susqun qalan kişiyə söz nisbət edilməz".

Rasulullah (sallallahu aleyhi və səlləm) in bu hədisi buna dəlildir : " Sizdən kim bir münkər görərsə, onu əli ilə dəyişdirsin. Buna gücü yetməzsə, dili ilə, buna da gücü yetməzsə, qəlbi ilə dəyişdirsin. Bu imanın ən zəif nöqtəsidir." (Müslim)

Hədis buna dəlalət edir ki, susan kişi qəlbi ilə inkar etmiş ola bilir. Bu durumda da mömin qala bilir. Bu hədis də eyni mənanı ifadə edir:

“ Başınıza bir sıra əmirlər gələcəkdir. Sizin qəbul etdiyiniz və etmədiyiniz işlər edəcəklər. Bunu rədd edən bundan bəri olar, inkar edən qurtulmuş olar. Ancaq buna razı olub tabe olanlar həlak olarlar. Dedilər ki, Ey Allahın Rasulu, onlarla savşaqmı? Dedi ki, namaz qıldıqları müddətcə onlara qarşı çıxmayın. Açıqdır ki, kim münkəri rədd edərsə, onun günahından və cəzasından qurtulmuş olur. Bu hal nə əliylə, nə də diliylə rədd edəcək durumda olmayanın halıdır. Bu durumda olanlar qəlbi ilə münkəri rədd etsin və ondan bəri olsun.

( Müslim Şərhi, 12/ 243)

Susqun qalan kişinin halı ehtimallı olduğu vaxta qədər onu təkfir etmək caiz deyildir. Ehtimallı fellərdən biri də (məsturul-hal) susqun olmaqdır.

b) bu mövzuda xataya düşən ikinci tayfa isə:

Bu bölgələrdə məsturul-hal olan müsəlmana İslam hökmü vermədə təvaqquf (durumu bəlli oluncaya qədər nə islam, nə də küfr hökmü verməmək) edən tayfadır. Ona İslam hökmü vermək üçün halını və etiqadını sınayıb araşdırmağı şərt qoşarlar. Bu görüş Əhnəsiyyə tayfasının görüşünə müvafiqdir. Onlar təvaqquf və təbəyyünü (araşdırmaq) şərt qoşarlar. Əbul- Həsən əl-Əşarinin “ məqalati İslamiyyin” adlı kitabının 1/180-ci səhifəyə baxa bilərsiniz.

Məsturul-hal olan kişi haqqında bu şəkildə təvaffuq etmək bidətdir. Bunun bidət olduğunun dəlili isə kişinin İslamına hökm etmək üçün gərəkli olan əlamətlərin böyük bir qisminin darul-hərbdə və ya savaş əsnasında ortaya çıxmasıdır.(Nisa 94) Bu dəlillər göstərir ki, hər kim darul-hərbdə islam əlamətlərindən birini izhar edərsə, o kişiyə İslam hökmü verilməsində tavaffuq olmaz. Kişi bu hal üzərində ölərsə, ona müsəlman müamiləsi edilir. Bu

mövzuda alimlər arasında ixtilaf yoxdur. Müsəlman kişinin qanı, malı və ırzı, istər küfr diyarında olsun, istərsə də islam diyarında, İslamın qoruması altındadır. (əl-Muğni, 9/ 335)

Söylədiyimiz bu mövzuya muttafiqun aleyh olan Usama bin Zeydin hədisi və Xalid bin Validin " Sabii olduq, sabii olduq" diyən bəni Cudeymə əsirlərini öldürdüyündə Peyğəmbərin (sallallahu aleyhi və səlləm) bunu qəbul etməməsi və buna bənzər nasslar dəlildir.

Hafiz bin Həcər əl-Hənbəli (r.h) deyir ki, İslam dinində bilinməsi zəruri olan mövzulardan biri də Peyğəmbərin ( sallallahu aleyhi və səlləm) yanına gəlib İslama girmək istəyənlərdən sadəcə kəlimeyi-şəhadəti istəməsidir. Bu onun İslamına hökm edilməsinə və qanının qorunmasına yetərdi. Usama bin Zeydin Lə İləhə İlləllah diyən adamı öldürməsinə Peyğəmbər (sallallahu aleyhi və səlləm) şiddətlə qarşı

çıxmışdır. İslama girmək istəyib Peyğəmbərin (sallallahu aleyhi və səlləm) yanına gələnlərə kəlimeyi-şəhadəti deməkdən başqa heç bir şeyi şərt qoşmazdı. Sonra isə namaz qilmasının və zəkat verməsinin vacib olduğunu bildirərdi. ( Cami əl-ulum vəl-hikəm, səh.72)
( Abdulqadir bin Abdulaziz, “əl-Cami, iman və küfr bölümü).

Şeyxin bu sözlərindən anlaşılır ki, zahirində İslam əlamətlərindən biri olan, yəni məsturul-hal olan insanları hökmən müsəlman qəbul etməkdədir. Bu durumda olan müsəlmanları təkfir edən və ya nə İslam, nə də küfr hökmü verməyib təvaffuq edən, İslam hökmü vermək üçün hal və etiqadlarının araşdırılmasını şərt qoşanların xata etdiklərini söyləməkdə və xaricilərə bənzətməkdədir. Bir kişiyə islam hökmü verməklə, o kişinin həqiqi müsəlman olmasının ayrı-ayrı şeylər olduğunu, bir insanda islama dəlalət edən əlamətlər

görüldüyündə islamına hökm etmək lazım olduğunu söyləməkdədir.

Əbu Qatadə əl-Filistini bu haqda belə deyir: “ İslam ümmətinin ümumunun küfrünə və dövrümüzdəki insanlarda əsil olanın küfr olduğuna inananlar bidət və zəlalət əhli olub bu dövrün xariciləri olaraq adlandırılmağa layiq olan insanlardır. Ancaq heç bir araşdırmağa (ehtimal və üzrə) ehtiyac buraxmayacaq şəkildə küfrünə dəlalət edən söz və ya fellərə sahib olan kimsəni təkfir etmək üçün bu söz və ya fellər xaricində heç bir şeyə ehtiyac yoxdur. Əsl İslam budur. Bundan başqaları bidət və zəlalətdir. Təkfir mövzusunu bu qədər uzatmaq tamamən qadağandır və zərərlidir.” (əl-Cihad vəl-İctihad, s. 143)

Başqa bir yerdə isə deyir: “ Bu düşüncəli sağlam fitrət sahibi olan avamı” Allah yolunda cihadın təməl maddəsi olaraq qəbul etmək önəmli və zəruri bir nöqtədir. Allahın lütfü ilə bu sələfi cihad camaatı ilə

təkfir camaatları arasındakı fərqlərdən biridir. Çünki bizə görə ümmətimizdə əsil olan İslamdır. Şərtləri yerində olan sarih bir küfür əlaməti görmədiyimizdə kişi üçün əsil olan İslamdır. Amma anlaşılmazlığı, təkfiri, təbəyyünü ( araşdırmağı) və təvaffuqu (hökm vermədə dayanmaq) müdafiə edən camaatlar bu sünnət yolu üzərində deyildirlər. Onlara görə ümmətimizdə əsil olan küfrdür. Və ya halları aydınlaşdırılıncaya qədər sükut edilməsi lazımdır. Bu səbəblə bunlar avamı İslama dəvət edilməsini lazım olanlar olaraq qəbul edirlər. Sələfiyyə cihad camaatları isə avamı müsəlman olaraq qəbul etməkdə və onları Allah yolunda cihad üçün yardımçı və yönəldilməsi lazım olan müsəlman olaraq görməkdədirlər.”

(əl-Cihad vəl-İctihad, s.288-289)

## *Son Nəsihətimiz!*

Ey qardaşlarım! Sizə nəsihətim budur ki, bu gün ortalığa atılmış bu fikirlərin necə mənfi nəticələr doğura biləcəyin bir düşünün. Hətta deyərdim ki, artıq bəziləri namazı İslam əlaməti görənləri murciyəlikdə, sapıqlıqda, bir az da irəli gedərək kafirlikdə ittiham etməyə başladılar. Bu adamlar işin mahiyyətini bilmədikləri üçün guya bunu Allah rizası üçün etdiklərini zənn edirlər. Amma hansı tələyə düşdüklərinin fərqində deyillər. Yaşadığımız cəmiyyətdə doğru düzgün namaz qılan çox az olduğu bir vaxtda onların da arasında təfriqələr yaratmaq kimə və nəyə xidmət etdiyi haqda düşünün.

Ey qardaşlarım! Bəzi cahil və hava əhli kimsələrin təkfirdə hədlərini aşdıqlarını və Ümməti-Muhəmmədin gənclərindən bəzilərini də arxalarınca sürüklədiklərini gö-

rərək sizə Şeyx Əbu Basir ət- Tartusinin önəmli sözlərini xatırlatmaq istəyirəm.

Ondan belə soruşuldu:

" Biz Misirdə yaşayırıq. Misir bu zamanda İslami deyə adlandırılan bütün bölgələr kimi mürtəd bir bölgədir. Çünki onlar İslam dinini tərk edib, tağutun dininə, şəriətinə və hökmünə girmişlər. Bu bölgənin xalqı Lə İləhə İllƏllah dediklərinə baxmayaraq, bəşəri qanunlarla mühakimə olmaq, qəbirlərə, türbələrə ibadət etmək, kafir din düşmənlərini dost tutmaq və Allahın dostları olan muvahhidlərlə savaşmaq kimi, bu kəlimeyi-şəhadəti pozan bütün əməlləri etməkdədirlər.

Sualım budur: Mən yaşadığım ölkədə kimliyi bilinməyən (Məchulul-hal) kimsəyə, İslam hökmünü (Hökmü İslam) vermirəm. Əqidəsini bildiyim kimsələrdən başqa, heç kimsənin arxasında namaz qılmıram. Sadəcə bildiyim muvahhidlərin kəsdiklərini yeyirəm. Belə etmək bidətdir-

mi? Kişinin Lə İləhə İlləllah deməsi ona İslam hökmü verməmiz üçün yetərlidirmi? Bu zamanda namaz qılmaq İslam əlaməti sayılırmı? Məlumdur ki, fətva iki əsas üzərində inşa edilir. Birincisi, haqqında söz edilən insanların halının bilinməsi. İkincisi, şəriətin hökmünün bilinməsi...

Onun cavabı bu oldu:

" Əlhəmdulilləhi Rabbil Aləmin.... Bu bölgələrdəki iqtidarların mürtəd olması, onun kölgəsi altında yaşayan müsəlmanların da mürtəd olması demək deyil.

Bizim ölkəmizin halı, Şeyxul İslam İbn Teymiyyədən soruşulan Mardin bölgəsinin halından çox fərqli deyil. Orada kafirlər iqtidarda, müsəlmanlar isə avam təbəqəsində idilər. Şeyxul-İslam bu cavabı verdi: " İstər Mardində, istərsə də başqa yerdə, Müsəlmanların qanları və malları toxunulmazdır. Mardinin darul-hərbmi, yoxsa darul-İslammı olduğu məsələsinə gəlincə, orası qarışıq bir dardır. Hər iki

sifətə də sahibdir.(darul-mürəkkəb) Bu dar nə ordusu Müsəlman olmaları səbəbi ilə İslam hökmləri ilə idarə olunan darul-İslam, nə də xalqı kafir olan darul-hərb hökmündədir. Ora qarışıq bir dardır. Üçüncü bir qisim dardır. Orada Müsəlmanlara haqq etdikləri kimi müamilə edilir, İslam şəriətindən çıxanlarla isə haqq etdikləri şəkildə savşılır.” ( Məcmu-ul-fətava 28/ 135)

Deyirəm ki, bu hökm bu çağdakı Müsəlman ölkələrinin çoxuna aiddir. Çünki onların vəsfləri Şeyxul-İslamdan soruşulan Mardin bölgəsinin vəsfləri ilə oxşardır.

Sənin ümumi olaraq, ayırım etmədən Misir və İslam ölkələrində yaşayan xalqları kafir və mürtəd olduqlarına, imanı pozan bütün ünsürləri işlədiklərinə dair sözün diqqətlə deyilməmiş və doğru olmayan bir sözdür. Toplumların və insanların hallarını bilmədiyini göstərir. Bu sənin

üçün dində və axirətdə pis sonluğu olacaq bir sözdür.

Sənin də dediyin kimi, şəri fətvaların iki şərti vardır: məsələnin vaqiəsini bilmək və bu vaqeəyə aid olan şəri dəlilləri bilmək. Sən isə Allahın qullarına verdiyin tələsik hökmündə, hər iki şərtə də riayət etmədin.

Buna binaən deyirəm ki, Kim, kəlimeyi-tövhid, namaz və sair İslam əlamətlərindən birini izhar edərsə, o kimsəyə İslam hökmünü vermək, arxasında namaz qılmaq, kəsdiyi əti yemək və s. Müsəlmanlara edilən müamiləni etmək vacibdir. Belə bir kişiyə başqa cür müamilə etmək və ya Allahın kitabı və Rasulunun (sallallahu aleyhi və səlləm) Sünnətindən açıq dəlil olan və mötəbər şəri mənası olmayan açıq bir küfr felini göstərmədiyi müddətcə küfr hökmünü vermək caiz deyil. Səhih bir hədisdə Allah Rasulu (sallallahu aleyhi və səlləm) belə buyurur: " Kim bizim qıldığımız namazı qılar,

qibləmizə yönələr, kəsdiyimizi yeyərsə, o Müsəlmandır. Allah və Rasulunun zimmətinə sahibdir”.(Buxari). Səhihi-Müslümdə belə bir hədis keçir: “Peyğəmbərimiz döyüşlərin birində “Allahu Əkbər” , “ Allahu Əkbər” deyən bir adamı eşitdi. “ Sən fitrət üzərindəsən” buyurdu. Adam “ Lə İləhə İlləllah” dedi, Peyğəmbərimiz : “ Atəşdən çıxdın” buyurdu.

Bu Peyğəmbərin (sallallahu aleyhi və səlləm) hökmüdür. Onun hökmünə və əmrinə müxalifət etmə. Yoxsa həlak olub saparsan!

Kimliyi təsbit edilməyən (məsturul-hal) olan kişinin arxasında namaz qılmağa gəlincə, Şeyxul-İslam bunun caiz olduğuna dair imamların ittifaqını nəql etdi. Dedi ki, “ Dörd imam və sair imamların ittifaqı ilə məsturul-hal olan hər müsəlmanın arxasında namaz qılmaq caizdir. Hər kim batini əqidəsini bildiyim kişilərdən başqa, heç kimsənin arxasında nə Cümə, nə də

camaat namazlarını qılmaram deyərsə, bu kişi səhabələrə, onlara xeyirdə tabe olanlara, müsəlmanların dörd imamına və digər imamlarına müxalif olan bir bidətçidir. (Məcmuul-Fətava,4/ 542)

Son olaraq bil ki, sənin üzərində olduğun etiqad Quran, Sünnət, səhabənin anlayışı, dörd imam və digər imamların etiqadına ziddir. Onun başlanğıcı şeytan və onun üfləməsindən, sonu uğursuzluq və dində həddi aşan bir sözdür. Bəlkə də daha sonra yer üzündə səndən başqa heç bir müsəlman olmadığına inanacaqsan. Bəlkə də (səndən öncə bu cür başlayanlarda olduğu kimi) gündə dəfələrlə özünü də təkfir edəcəksən. Mən səni bu halından dolayı Allahla qorxuduram.” ( Otuz Risalə, səh.495-496)

Şeyx Abdulqadir bin Abduləziz Müsəlman ölkələrdə yaşayan müsəlmanların tamamını təkfir edən bidətçi xaricilərə cavab verərək belə deyir:

“ Onların şübhələrindən biri budur: “ Bu gün hal dəyişmişdir və insanlar kəlimeyi-şəhadətin mənasını bilmədən söyləyirlər. Bundan dolayı onlara iman hökmü vermək üçün sadəcə kəlimeyi-şəhadəti söyləmələri yetərli deyildir. Şəhadəti əhatə edən inkar və isbatın mənasını bilib bilmədiklərini öyrənmək üçün araşdırmaq lazımdır.

Bu şərtin şəri bir dəlili yoxdur. Bu Rasulullahın (sallallahu aleyhi və səlləm) və səhabələrinin əməlinə ziddir, müxalifdir. Çünki onlar İslam hökmü vermə haqqında kəlimeyi-şəhadəti iqrar edən kişinin bunu necə anladığını araşdırmadan İslam hökmünü verməkdən geri durmamışlar. Allah Rasulu (sallallahu aleyhi və səlləm) belə buyurdu: “ Allahın kitabında olmayan hər şərt batildir”( Buxari) və yenə belə buyurmuşdur: “ Kim bizim əməlimiz üzərində olmayan bir əməl edərsə, o əməl rədd edilir” (Müslim). Yenə bu

şərti qoşanlara “ Zatu- Ənvat” hədisi problemli gələcəkdir. Çünki Rasulullah-dan (sallallahu aleyhi və səlləm) zatu ənvat edinməyi istəyənlər onun kəlimeyi-şəhadətə zidd olduğunu bilmirdilər.

Bu mövzuda doğru olan budur ki, Müslümdə keçən Osmanın hədisindəki kimi “ Kəlimeyi-şəhadəti söyləmək elm-dir”. Ancaq ixlas, yəqin və sair Lə İləhə İlləllahın sihhətinin şərtlərini bilmək axirətdə sahibinə xeyri olan həqiqi İslamın sihhətinin şərtlərindəndir. Bu şərtlər əqidə kitablarında zikr edilməkdədir.

Ancaq dünya hökmlərində hökmi İslam kəlimeyi- şəhadəti tələffüz etməklə olur. Bundan sonra kim dinində bir nöqsan edərsə, şərtləri ilə birlikdə o nöqsanına görə küfr və ya fasiqlik hökmü verilir. Dolayısıyla hökmi İslam, İslamın hər hansı bir əlamətini göstərməklə olur. Lakin həqiqi olaraq kəlimeyi-şəhadətin sihhətinin qalan şərtlərini yerinə yetirərsə,

sahibinə axirətdə faydalı olar. Əgər sihhətinin qalan şərtlərini yerinə yetirməzsə, sahibinə axirətdə faydalı olmaz.

Biz isə bu kişinin həmin şərtləri yerinə yetirib yetirməməsini araşdırmaqla mükəlləf deyilik. Ancaq İslam hökmü verilir. Daha sonra nöqsanlarından dolayı hesaba çəkilir.

Qanı və malı qorumaq, evlilik, mirasın sihhəti və bütün dünya hökmlərinin ona bağlı olduğu zahiri İslam ilə Allah qatındakı savab, cəza və bütün axirət hökmlərinin ona bağlı olduğu həqiqi İslam arasında ayırım etməmək bir çox insanın düşdüyü xatadır.

İbn Teymiyyə belə deyir: " İman və küfr məsələlərində danışanların çoxu- bidətçilərin təkfir edilməsi üçün- bu mövzunu fərq etməmişlər. Zahir ilə batin hökmü arasında ayırım etməmişlər. Halbuki bu fərq mütəvatir nasslarla və məlum icma

ilə sabitdir. Hətta İslam dinində zərurətlə bilinən mövzulardandır.”

( Məcmuul-fətava, 7/472) (əl-Camii, 556)

Şeyx Eymən əz-Zəvahiri Misirdəki Cihad camaatının əmiri ikən yazdığı “Cihadut-Tavagit” adlı əsərində deyir:

“ Müsəlman toplumlarda Müsəlman-fasiq-kafir qarışmışdır. Hətta müsəlmanla-rın belə əməlləri qarışmışdır. Bu xalq haqqında veriləcək hökm Əhli-Sünnətin mötəbər şəri hökmlərinə dönməklə bilinir. Onlar ki:

-Kəlimeyi-şəhadət, namaz, zəkat kimi İslam əlamətlərini göstərən kimsələr müsəlmandır. Ta ki, İslamı pozan bir hərəkəti edincəyə qədər.

-Küfr hərəkətini edənlərin isə halına baxarıq. Onun haqqında cəhalət, ikrah və qəsdin olmaması kimi şəri bir üzür yoxdursa, hökmü küfrdür. Şəriətin

gözündə üzrlü olanları Allahın şəriətinə dayanaraq üzrlü görürük.

-Biz halının bilinməsinə ehtiyac duyulunanlardan başqa toplumun fərdlərinin halını araşdırmarıq. Ancaq tağutun yardımçıları və əsgərləri, zəlalətə və sapıqlığa dəvət edən bəlamlar, dəvətin önündə əngəl olan kimsələr bunlardan müstəsnadır.

- Nikah, miras kimi gərəkli hallardan başqa avam xalqın və insanların çoxunun hökmünü araşdırmarıq. Çünki bu insanların əlacı İslami hökuməti qurmaqdır. Allah İslam dövlətini xalqı atəşdən qoruyan bir qalxan və Onun rizasına qovuşduran bir yol qılmışdır. Ancaq İslam dövləti olmadığı zaman durumlar qarışır. Şeyxuyl-İslam İbn Teymiyyənin Mardinin haqqında verdiyi fətvada bunu görürük:

" Müsəlmana haqq etdiyi hökm ilə və kafirə də haqq etdiyi hökm ilə davranılır"

Məncə bu qədəri sizə yetər. İbrət almaq istəyən kişi bundan faydalansa, onun üçün bu kiçik risalədə çox böyük faydalar var. Çünki biz əsla öz sözümüzü deyil, Quran, Sünnət və sələfin sözlərini yazdıq. Allahu Təaladan bu əməyimizi bizim üçün axirət xeyrinə çevirməsini istəyirik. Həqiqətən axirət xeyrindən başqa heç bir xeyir yoxdur. Dualarımızın sonu Həmd olsun aləmlərin Rəbbi olan Allaha. Amin!